## Peyğəmbəri ﷺ sevmək

Həqiqətən şükür və tərif yalnız Allaha məxsusdur! Biz Ona həmd edirik, Onu köməyə çağırırıq, Ondan bağışlanma və bizi doğru yola yönəltməyi diləyirik, nəfslərimizin şərindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Allah kimə hidayət verərsə onu azdıran tapılmaz, kimi azdırarsa onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

**“Ey iman gətirənlər! Allahdan Ona layiq olan tərzdə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!”**

**“Ey insanlar! Sizi tək bir candan xəlq edən, onun özündən zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın *törədib yer üzünə* yayan Rəbbinizdən qorxun! Adı ilə birbirinizdən *cürbəcür şeylər* istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir”.**

**“Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz danışın ki, O, əməllərinizi islah etsin və günahlarınızı bağışlasın. Kim Allaha və Onun Elçisinə itaət etsə, böyük bir uğur qazanar”.**

### Kəlimələr və onların mənası:

### a) Məhəbbət sözünün lüğəti mənası:

Lisan əl-ərəb əsərində deyilir: Məhəbbət nifrətin əksidir və sevgi mənasındadır. Məhəbbət əl-hubb sözündən əmələ gəlmişdir.[1] İbn əl-Qeyyim demişdir: Ərəb dilində əl-hubb sözü beş mənanı ifadə edir:

[1] Lisanul ərəb əsəri, Ha bə bə fəsli, 1/289.

1- Saflıq və bəyazlıq: Ərəblər dişlərin ağ olmasına hibab əl-əsnan deyirlər.
2- Ucalmaq və zahirə çıxmaq: Yağış yağdıqda üzə yığılan suya hibab əl-ma deyilir.
3- Oturub bir yerdə qalmaq: dəvə oturub yerində qaldıqda ona həbbəl bəir-deyirlər. Şair demişdir:
Səhralıqda ona elə bir zərbə endirdim ki,
Sanki oturmuş vəziyyətdə olan pis bir dəvəni vurdum.
4- Əsas və daxil: Qəlbin içərisinə hibbətul qalb, dənli bitginin bir dənəsinə isə həbbə deyilir.
5- Yerləşmək və hifz etmək: Su qabına hibbul mə deyilir. Çünki həmin qab suyu qoruyur və hifz edir.

Şəkk yoxdur ki, məhəbbət sözü bu beş mənanı əhatə edir. Yəni sevgi safdır, ucadır, sabitdir, bir yerdə qalandır və qəlbin daxilini əhatə edəndir.[1]

**B– Məhəbbət sözünün terminaloji mənası:**

Qazı İyad Allaha və peyğəmbərinə qarşı olan sevgi barədə alimlərin ixtilafını qeyd etdikdən sonra demişdir: “Məhəbbətin mahiyyəti: insana münasib olan bir şeyə meyl etməkdir. Bu da ki:

- Ya hər bir normal insanın ləzzət aldığı şeylərə, o cümlədən gözəl surət, səs, yemək-içmək və ya digər bu kimi şeylərə meyl etməklə olur.
- Ya qəlbinin dərinliklərində batini mənalarla, məsələn əməlisaleh şəxsləri, alimləri, yaxşı şəxsləri sevməklə olur. Məlumdur ki, insanın təbiəti ehtirasa meyillidir. Hətta bəzən bir qövm digərinə tərəfdar olur və bununla diyarlardan məcburi köçürmələr, haram işlər görülməsi və insanların rahatsızlığı baş verir.

[1] Mədaricus Səlikin əsəri, 3/9-10.

- Ya da ola bilsin ki, bir yaxşılığın müqabilində bir insan digərinə meyl etsin. Çünki insanın təbiəti ona qarşı yaxşılıq edənə tərəf yönəlir.[1]
- İbn əl-Qeyyim demişdir: "Məhəbbətə onun özündən daha yaxşı tərif vermək mümkün deyil. Çünki bütün təriflər onu daha da anlaşılmaz edir. Məhəbbətin tərifi onun varlığıdır. Məhəbbət özündən daha aydın bir şeylə vəsf oluna bilməz. İnsanlar isə sadəcə olaraq məhəbbətin səbəbləri, onu vacib edənlər, əlamətləri, şahidləri, səmərələri və əhkamları barədə danışmışlar. İnsanların məhəbbətə verdikləri təriflər bu altı məsələ ilə əlaqədar olmuşdur. Beləliklə də insanlar malik olduqları elmə görə müxtəlif ifadələrlə və çoxlu işarələrlə buna tərif verməyə çalışmışlar."[2]

  İbn Həcər əl-Əsqəlani demişdir: "Dahilərə görə məhəbbət tərifolunmaz məlumatlardan ibarətdir. Onu hiss edən şəxs bilir ki, məhəbbət ifadəolunmaz bir hissdir."[3]

**C- Peyğəmbər (ən–Nəbi) sözünün lüğəti və terminaloji mənası.**

Nəbi sözü xəbər sözündən əmələ gəlmişdir. Uca Allah buyurmuşdur: **"Qullarıma xəbər ver ki, Mən Bağışlayanam, Rəhmliyəm."**[4] Həmçinin buyrmuşdur: **"*Peyğəmbər* bunu ona bildirdikdə *zövcəsi* dedi: "Bunu sənə kim xəbər verdi?" O dedi: "Bunu mənə *hər şeyi* Bilən, Xəbərdar olan *Allah* xəbər verdi! "**[5]
Lisan əl-ərəb əsərində deyilir: "Nəbə sözünün mənası xəbər deməkdir, cəmi ənbə-dir. Nəbi isə Allahdan xəbər verən kəsə deyilir."[6]

Şeyx Saleh Ali Şeyx demişdir: "Nəbi başqalarından fərqli olaraq ucalmış mənasındadır. Beləliklə Nəbi o kəsə deyilir ki, Allah

[1] Əş-şifə bitarif huququl Mustafə əsəri, 2/29-30.
[2] Mədaricus Səlikin əsəri.
[3] Fəthul Bari əsəri, 17/191.
[4] əl-Hicr surəsi, 49.
[5] ət-Təhrim surəsi, 3.
[6] Lisanul ərəb əsəri, 1/162-163.

həmin kəsə vəhy verməklə onu digərlərindən fərqləndirmiş və məqam etibarı ilə ucaltmışdır.”[1]

## Məhəbbətin növləri:

Məhəbbət sözü iki qismə bölünür:
1-Təqdirəlayiq və faydalı məhəbbət,
2-Zərərli və məzəmmət olunmuş məhəbbət.

Birinci qism: Faydalı məhəbətdir. Bu növ insanı səadətə çatdırır. Bu da üç növdür:
a) Allahı sevmək.
b) Allah üçün sevmək.
c) Allaha itaət edib ona qarşı asilik etməkdən çəkindirən şeyləri sevmək.

Allahı sevməyə gəlincə bu yalnız Allahı sevib bunda Ona heç bir şeyi şərik qoşmamaqla olur. Çünki əsl sonsuz sevgiyə layiq olan yalnız Odur. Bu məhəbbət Allaha ibadət edib, Onun buyurduqlarına itaət etməklə olur.

Allah üçün sevmək isə möminləri Allah üçün sevməyə və yalnız Allahın sevdiklərini sevməyə deyilir.

Allaha ibadət etməyə kömək edən əməlləri sevmək isə bütün ibadətlərdə olur.

İkinci qism: Məzəmmət olunmuş məhəbbət.
Bu növ məhəbbət sahibinə bədbəxtlik gətirir. Bu da üç növdür:
1-Allahla bərabər başqasını sevmək.
2-Allahı qəzəbləndirən şeyləri sevmək.
3-Allaha olan məhəbbəti azaldan və ya onu yox edən əməlləri sevmək.

Birinci növə müşriklərin Allahla yanaşı öz ilahlarını sevmələri daxildir.

İkinci növə Allahın qəzəbinə səbəb olan pis və münkər əməllər daxildir.

Üçüncü növ isə Allaha qarşı olan məhəbbətin azalmasına səbəb olan fasiq və pozğun qadınları sevməkdir.[2]

---
[1] Şərh əqidətut Tahaviyyə əsəri, 1/311-312.
[2] Məvsuətu əd-difə ən rasulilləh, 4/278; İğasətul Ləhfan, 2/140-141; Camiul rəsail, 2/202.

## Allahı və Onun peyğəmbərini sevməyin vacibliyi.

Allahı sevmək yalnız Onun peyğəmbərini sevməklə kamil olur. Uca Allah buyurmuşdur: **"De: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah Bağışlayandır, Rəhmlidir"**[1] Bu növ məhəbbət imanın əsaslarından və vaciblərindən hesab olunur. Odur ki, hər bir mömin Allahı və Onun rəsulunu hamıdan çox sevməlidir.

Şeyxul İslam İbn Teymiyyə demişdir: "Məlumdur ki, Allahı sevmək yalnız Onun rəsulunu təsdiq edib dediklərinə itaət etməklə olur."

Allahı sevən hər bir kəsin peyğəmbərə tabe olması və Allah yolunda cihad etməsi lazımdır. Uca Allah buyurmuşdur: **" Möminlər ancaq Allaha və Onun Elçisinə iman gətirən, sonra heç bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə cihad edənlərdir! *İmanlarında* sadiq olanlar da məhz onlardır. "**[2] Bu möminin Allaha qarşı olan sevgisidir.

Allaha və Onun rəsuluna, habelə Onun yolunda cihad etməyə mane olan kəslərə qarşı nifrət bəsləmək Allahı sevməyin kamilliyindəndir. Uca Allah buyurmuşdur: **"Allaha və Axirət gününə iman gətirən elə bir camaat tapa bilməzsən ki, onlar Allaha və Onun Elçisinə düşmən olanlarla – öz ataları, oğulları, qardaşları, qohum-əqrəbaları olsalar belə – dostluq etsinlər. Allah onların qəlbinə iman salmış və onları Öz tərəfindən bir ruhla dəstəkləmişdir. "**[3] [4]

Muslimin "Səhih" əsərində Ənəsdən peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: "Üç xüsusiyyəti özündə cəm edən şəxs imanın şirinliyini dadmış olar. Allahı və Onun rəsulunu hamıdan çox sevmək, bir insanı yalnız Allah üçün sevmək və oda düşməkdən çəkindiyi kimi küfrə qayıtmaqdan da çəkinmək ."[5]

İmam ən-Nəvəvi bu hədisi şərh edərək demişdir: Bu hədis İslamın əsaslarından sayılan möhtəşəm bir hədisdir. Alimlər demişlər ki:

---

[1] Ali İmran, 31.
[2] əl-Hucurat, 15.
[3] əl-Mücadələ, 22.
[4] Məcmu əl-fətava, 8/361-366.
[5] Səhih Muslim, 67.

Burada imanın şirinliyi deyildikdə itaətlərdən həzz almaq, Allahı və Onun rəsulunu razı salmaq, bunları bütün dünyavi istəklər və insanların sevgilərindən üstün tutmaq, Allahı Onun buyurduqlarına itaət edib qadağalarından çəkinməklə sevmək habelə peyğəmbəri sevmək nəzərdə tutlur. Əl-Qazi demişdir: Bu hədis digər bir hədisdəki kimidir: "Allahı Rəbb, İslamı din və Muhəmmədi rəsul olaraq (qəbul edib) razı qalan kəs imanı dadmış olar."[1]

Şeyx İbn Useymin bu hədisə şərh verərək demişdir: "Peyğəmbəri ﷺ sevmək Allahı sevməyə aiddir. Çünki peyğəmbəri özündən və bütün insanlardan çox sevməyən kəsin imanı kamil olmaz. Allahı sevmək isə daha önəmli və mühümdür. Hədisdəki: "... başqalarının sevgisindən daha çox olarsa ..."-deyildikdə onları bütün dünyadan, özündən, övladından, həyat yoldaşından və hər bir şeydən daha çox sevmək nəzərdə tutulur."[2]

Həmçinin demişdir: "... Hədisdə qeyd olunur ki, Allahı və Onun rəsulunu hamıdan çox sevmək, Allahı sonra isə peyğəmbərini sevmək deyilmir, çünki, peyğəmbəri sevmək Allahı sevməyə tabedir. İnsan Allahı nə qədər çox sevirsə, Onun rəsulunu da bir o qədər çox sevir. Allaha olan sevgi artdıqca peyğəmbər sevgisi də artmış olur."[3]

Peyğəmbəri ﷺ sevməyin vacib olduğuna dəlil Uca Allahı bu ayəsidir: **"İman gətirənlər Allahı daha çox sevərlər."[4]** Bu ayə peyğəmbəri sevməyin vacibliyinə dəlildir. Çünki Allahın sevdiklərini də sevmək Allah sevgisinə daxildir. Allah da öz sevimli peyğəmbərini sevdiyinə görə bizlərin də onu sevməsi vacib olur. Məlumdur ki iman əhlini sevməyin əsasında da Allah sevgisi dayanır. Allahı sevən kəs Onun sevdiklərini də sevməlidir. Allahdan başqa bütün sevilənlər də Allah sevgisinə tabe sayılır . Bunun də səbəbi ondan ibarətdir ki, Allahdan savayı özünə görə sevilməyə layiq olan heç bir məxluq yoxdur. Peyğəmbər ﷺ də Allah üçün sevilməli, Allah üçün ona itaət olunmalı, yenə Allah

---

[1] Səhih Muslim ən-Nəvəvinin şərhi.
[2] əl-Qovlul mufid, 2/53-54.
[3] Şərh riyadus salihin, 1/432.
[4] əl-Bəqərə, 165.

üçün ona tabe olunmalıdır. Həmçinin digər peyğəmbərlər, əməlisaleh şəxslər və yaxşı əməllər də Allahın onları sevdiyinə görə sevilməlidirlər.

**Quran və Sünnədə Allahı və peyğəmbəri sevməyin vacibliyini göstərən bəzi dəlillər.**

Qurani Kərim və peyğəmbərin ﷺ Sünnəsində möminləri Allahı və Onun rəsulunu ﷺ sevməyə təşviq edən bir çox dəlillər mövcuddur.

Birinci: Uca Allah buyurur: **"Peyğəmbər möminlərə onların özlərindən daha əzizdir "**[1]

İmam Əş-Şövkani demişdir: "Yəni Peyğəmər ﷺ insanlara bütün dini və dünyəvi məsələlərdən öndə gəlir və möminlər onu özlərindən daha çox sevməlidirlər. Gərək onu möhtac halda olsalar belə mal-dövlətərindən, hətta öz canlarından belə daha çox sevsinlər. Əgər peyğəmbərin ﷺ sözü insanları bir şeyə, insanların nəfsi istəkləri isə bir başqa şeyə səsləyərsə gərək peyğəmbərin sözünü nəfsi istəklərdən öndə tutaraq ona riayət edilsin."[2]

Şeyxul İslam İbn Teymiyyə Uca Allahın: **"Peyğəmbər möminlərə onların özlərindən daha yaxındır. Zövcələri isə möminlərin analarıdır. Qohumlar Allahın yazısına görə bir-birlərinə möminlərdən və mühacirlərdən daha yaxındırlar. Dostlarınıza yaxşılıq etmək isə istisnadır. Bunlar Kitabda yazılmışdır."**[3] **-**ayəsinin aşağıdakı səhih hədisin mənasında olduğunu demişdir: "Mən hər bir möminə yardım etməyə onun özündən daha haqlıyam, hər kim özündə sonra mal-dövlət qoyub gedərsə onun varislərinə çatmalıdır. Özündən sonra əhli-əyal və ya tələf olmuş bir şey qoyub gedərsə ona yardım etmək mənlikdir." Beləliklə də Uca Allah peyğəmbəri insanlara onların özlərindən daha yaxın etmişdir. Sonra qohumları bir-birinə yaxın etmişdir ki

---

[1] əl-Əhzab, 6.
[2] Fəthul bari əsəri, 4/372.
[3] əl-Əhzab, 6.

qarşılıqlı yardım etsinlər. Çünki əgər peyğəmbər insanlara onların özlərindən daha yaxındırsa, onların qohumlarından da təbii ki yaxındır.

İkinci: Uca Allah buyurur: **"De:"Əgər atalarınız, oğullarınız, qardaşlarınız, zövcələriniz, yaxın qohumlarınız, qazandığınız mallar, iflasa uğramasından qorxduğunuz alış-verişiniz və bəyəndiyiniz məskənlər sizə Allahdan, Onun Elçisindən və Onun yolunda cihaddan daha əzizdirsə, Allah Öz əmrini verincəyə qədər gözləyin. Allah günahkarları doğru yola yönəltməz."**[1]

Ayədəki kəlimələrin şərhi:

Qohumları: Yəni əmiləri və onların övladları kimi qohumlar.

Əldə etdiyiniz: Törətdiyiniz.

Məhv olmasını: Ziyana uğramasını.

Razı qaldığınız mənzillər: O mənzillər ki sizin xoşunuza gəlir və orada qalmaq sizin Allah və Rəsulu yolunda hicrət etməkdən çəkindirir.

Allahın əmri gələnədək: Yəni Məkkənin Fəthi günü başınıza gələcək bəlaya qədər.

Allah fasiq qövmə hidayət verməz: O kəslər ki, itaətdən boyun qaçırır və əmr və ya qadağalara məhəl qoymur.

Qazı İyad demişdir: Bu ayə peyğəmbəri sevməyin vacibliyinə ən böyük dəlil, təşviq, tənbeh və sübutdur. Çünki Allah bu ayədə özünü, mal-dövlətini və əhli əyalını Allah və Onun rəsulundan çox sevənləri: **"Allahın əmri gələnədək gözləyin"** - deyə hədələmişdir. Ayənin sonunda isə Allah onları fasiq adlandırmış, onların yollarını azaraq hidayətdən uzaq düşdüklərini bəyan etmişdir.

**Üçüncü:** Ənəsdən rəvayət olunur ki, peyğəmbər ﷺ demişdir: "Sizlərdən biriniz məni atasından, övladından və bütün insanlardan çox sevməyincə iman gətirmiş olmaz."[2]

Abdullah ibn Hişam rəvayət edir ki, bir dəfə biz peyğəmbərlə ﷺbirlikdə olarkən o, Ömər ibn Əl-Xəttabın əlindən

[1] ət-Tövbə, 24.
[2] əl-Buxari, 15; Muslim, 178.

tutmuşdu. Ömər ona dedi: Ey Allahın rəsulu, səni özümdən savayı hər şeydən çox sevirəm. Peyğəmbər ﷺ dedi: "Xeyr, nəfsim Əlində olana and olsun ki, gərək məni özündən də çox sevəsən." Ömər dedi: Allaha and olsun ki, indi mən səni özümdən də çox sevirəm. Peyğəmbər ﷺ buyurdu: "Bax indi (imanın kamil oldu) ey Ömər".

Şeyx İbn Üseymin demişdir: "Peyğəmbər ﷺ müxtəlif səbəblərə görə sevilməlidir:

1- Əgər sən Allahı hər şeydən çox sevirsənsə, o zaman Onun peyğəmbərini də hər bir məxluqdan çox sevməlisən.

2- Peyğəmbər ﷺ Allaha ibadət edərək onun risaləsini yaymışdır.

3- Allah ona bir çox gözəl əxlaq və əməllər vermişdi.

4-Sənin hidayətə varmağına və öyrənməyinə səbəbkar peyğəmbərdir.

5- Şəriəti təbliğ edərkən müxtəlif əziyyətlərə düçar olduğuna görə.

6- Allah kəliməsinin ucalması üçün malını və canını fəda etdiyi üçün .

Bu hədisdən aşağıdakı faydalar götürülür:

1- İnsan gərək peyğəmbəri özündən də çox sevsin.

2- Rəsulullah yolunda malını və canını fəda etmək gərəkdir . Çünki gərək peyğəmbər sevgisi insanın özündən və malından da güclü olsun.

3- Peyğəmbərin ﷺ sünnəsinin yayılması yolunda mal, can və enerji sərf etmək lazımdır. Bu peyğəmbər sevgisinə daxildir. Bəzi alimlər Uca Allahın: **"Doğrusu, sənə ədavət bəsləyənin özü sonsuzdur."[1]-** ayəsi barəsində demişlər ki, peyğəmbərin gətirdiyi şəriətə ədavət və nifrət bəsləyən hər bir kəs, xeyirdən məhrum və sonsuzdur.

4- Peyğəmbərin ﷺ sözünü başqalarının sözündən üstün tutmaq. Belə ki, insan hamıdan çox sevdiyi kəsin sözünü digərlərinin sözlərindən, hətta öz sözündən belə üstün saymalıdır.

**Dördüncü:** Ənəs ibn Malikdən rəvayət olunur ki; "Bir dəfə bir kişi peyğəmbərin yanına gələrək soruşdu: Ey Allahın rəsulu, Qiyamət saatı nə zamandır? Peyğəmbər ﷺ ondan soruşdu: "O saat

[1] əl-Kövsər, 3.

üçün nə hazırlamısan?” O dedi: Allahı və Onun rəsulunu sevməyi. Peyğəmbər ﷺ dedi: “Şübhəsiz ki, sən sevdiyinlə birlikdə olacaqsan.”
Ənəs dedi: İslamı qəbul etdikdən sonra ən çox sevindiyimiz söz peyğəmbərin: ”Şübhəsiz ki, sən sevdiyinlə birlikdə olacaqsan.”-sözü oldu. Sonra Ənəs yenə dedi: Mən Allahı, Onun elçisini, Əbu Bəkri və Öməri sevirəm. Ümid edirəm ki, onlar kimi yaxşı əməllər edə bilməsəm belə onlarla birlikdə olacağam.”[1]

**Beşinci:** Əbu Hureyradən rəvayət olunur ki, peyğəmbər ﷺ demişdir: “Ümmətimdən məni ən çox sevənlər o kəslərdir ki, onlardan biri məni görmək üçün mallarından və yaxınlarından keçməyə hazırdır.”[2]

**Peyğəmbəri sevmək barədə səhabələrdən varid olan rəvayətlər.**

Amr ibn Asdan rəvayət olunur ki; “Mənə Allahın elçisindən daha sevimli, gözüm də daha böyük bir kimsə yox idi. Hətta mən onun böyüklüyündən gözümü ona zilləyə bilmirdim. Kimsə məndən xahiş etsə ki, peyğəmbəri ﷺ vəsf edim bunu edə bilmərəm, çünki mən gözlərimi ona zilləyə bilmirdim.”[3]

Bir dəfə Əli ibn Əbu Talibdən soruşmuşdular ki; Rəsulullahı ﷺ necə sevirdiniz? O dedi: “Allaha and olsun ki, o bizə mal-dövlətimizdən, övladlarımızdan, ata-analarımızdan, hətta susuz halda rast gəlinən soyuq sudan daha sevimli idi.“
Əbu Sufyan ibn Hərb o zaman hələ müşrik olarkən Zeyd ibn Dəsnədən Məkkə əhlini Həramdan çıxarıb öldürmək istədikdə (o Raci günü əsir götürülmüşdü) soruşmuşdu ki; Ya Zeyd, səni Allaha and verirəm, istərdinmi ki, indi Muhəmməd sənin yerində burada olsun, sən isə öz yaxınlarının yanında olasan? O belə cavab vermişdi: Allaha and olsun ki, mən yaxınlarımın yanında, Muhəmməd isə olduğu yerdə ona bircə tikan belə batmasını

[1] Buxari, 3688; Muslim, 6881.
[2] Muslim, 7323.
[3] Muslim, 336.

istəmirəm.“ Əbu Süfyan dedi: Mən insanların içərisində səhabələrinin Muhəmmədi sevdiyi qədər kiminsə başqasını sevdiyini görməmişəm.

Şabi demişdir: Bir dəfə bir nəfər ənsar peyğəmbərin ﷺ yanına gəlib dedi: Sən mənə, özümdən, övladımdan, mal-dövlətimdən və yaxınlarımdan daha sevinlisən, əgər sənin yanına gəlməsəydim öləcəyimi zənn etdim. Bunu deyərək ənsar ağlamağa başladı. Peyğəmbər ﷺ soruşdu: “Nə üçün ağlayırsan?” O dedi: Yadıma düşdü ki, sən öldükdə yüksək yerdə peyğəmbərlərlə birlikdə olacaqsan, biz isə Cənnətə daxil olduqda səndən aşağı səviyyədə olacağıq. Peyğəmbər ﷺ ona bir şey demədi: Sonra İzzət və Cəlal Sahibi olan Allah rəsuluna bu ayəni nazil etdi: **“Allaha və *Onun* Elçisinə itaət edənlər Allahın özlərinə nemət bəxş etdiyi peyğəmbərlərlə, sidq ürəkdən inananlarla, şəhidlərlə və əməlisalehlərlə birlikdə olacaqlar. Onlar necə də gözəl dostlardır. “**[1]

Peyğəmbər ﷺ dedi: “Sevin.”

Səid ibn Müaz Bədr günü peyğəmbərə demişdi: “Ey Allahın rəsulu, gəl sənə kölgəsində durmağın və rahatlanmağın üçün bir yer düzəldək, sonra da gedib düşmənimizlə döyüşək. Əgər Allah bizi izzətləndirsə və biz düşmənlərimiz üzərində qalib gələ bilsək istəyimizə nail olarıq, yox əgər belə olmasa sən yenə öz yerində oturmuş, sonra da geriyə qövmünün yanına dönmüş olarsan. Orada elə insanları qoyub gəlmişik ki, onlar səni bizdən heç də az sevmirlər. Onlar sənin döyüşə atılacağından xəbərdar olsaydılar indi geridə qalmazdılar. Sən onlara rəhbərlik edərdin, onlar da sənin nəsihətlərinə riayət edərək səninlə birlikdə vuruşardılar. Peyğəmbər ﷺ bu sözləri eşitdikdə onu tərifləyərək ona xeyir dua etdi.”[2]

Ənəs ibn Malikdən rəvayət olunur ki: Uhud döyüşündə müşriklər şaiyə yaydılar ki; Muhəmməd ölüb. İş o yerə çatdı ki, hətta Mədinə tərəfdən qışqırtı səsləri eşidilirdi. Sonra ənsarlardan olan bir qadın bilmirəm ya atasını, ya ərini, ya da qardaşını

---

[1] ən-Nisa,69.
[2] İbn Hişamın sirası 2/192; ibn Kəsirin Bidəyə əsəri 3/268.

qarşılayarkən soruşdu: Bu kimdir? Dedilər: atan, qardaşın, ərin, oğlun. Qadın soruşdu: Peyğəmbər haradadır? Dedilər: Oradadır. O peyğəmbərin yanına gələrək onun paltarının bir tərəfini tutub dedi: Atam-anam sənə qurban ey Allahın rəsulu, sən sağ ikən heç nə mənim üçün önəmli deyil.[1]

**Peyğəmbərimiz Muhəmmədi ﷺ sevməyin növləri.**

a) Vacib sevgidir ki, bu da orta yol tutanların sevgisidir .
Bu o deməkdir ki , insan Allah və onun rəsulunu hər şeydən daha çox sevməlidir və onların nifrət etdikləri şeyləri sevməməlidir. Uca Allah buyurmuşdur: **"Allaha və Axirət gününə iman gətirən elə bir camaat tapa bilməzsən ki, onlar Allaha və Onun Elçisinə düşmən olanlarla – öz ataları, oğulları, qardaşları, qohum-əqrəbaları olsalar belə – dostluq etsinlər. " (Əl– Mücadələ surəsi, 22-ci ayə)** Bu Allahın vacib buyurduqlarına məhəbbət bəsləməyi və Onun buyurduqlarına qarşı nifrət bəsləməyi vacib edir. Vacibləri istəməklə insan onları etməyə can atmalı, habelə nəhy olunmuş şeylərdən çəkinməlidir. Uca Allah buyurur: **"Bu ona görədir ki, onlar Allahın qəzəbinə səbəb olan şeyə uydular və Onun razı qaldığı şeyə nifrət etdilər. Buna görə də *Allah* onların əməllərini boşa çıxartdı." (Muhəmməd surəsi , 28 – ci ayə)**

Həmçinin buyurmşdur: **"Bir surə nazil edildiyi zaman onlardan *istehza ilə*: "Bu, hansınızın imanını artırdı?"– deyənlər də var. İman gətirənlərə gəldikdə isə, *o surə* onların imanını artırır və onlar bir-birlərini müjdələyirlər. Qəlbində xəstəlik olanlara gəlincə, *o surə* onların murdarlığı üstünə bir murdarlıq da artırır və onlar kafir olaraq ölürlər." (Ət-Tövbə surəsi, 124-125 – ci ayə)** Həmçinin buyurur: **"Kitab verdiyimiz kəslər sənə nazil edilənə sevinirlər. Firqələr arasında eləsi də vardır ki, onun bir qismini inkar edirlər." (əl-Rəd surəsi, 36-ci ayə)**
b) Müstəhəb sevgi, bu da öndə gedənlərin sevgisidir.
Öndə gedənlərin məhəbbəti Allahın sevdiyi nafilə və fəzilətləri tam sevməkdir. Bu Allaha yaxın olan bəndələrin əlamətidir. Allahı

[1] Heysəminin Məcmə əl-zəvaid əsəri 6/115.

və Onun rəsulunu sevmək vacib olduğu kimi, onların nifrət etdikləri şeylərə nifrət etmək də eyni ilə vacib sayılır.

**Peyğəmbəri sevməyin əlamətləri :**

**1- Ona tabe olmaq:**
Uca və Nöqsansız olan Allah buyurur: **"De: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah Bağışlayandır, Rəhmlidir". (Ali İmran surəsi, 31-ci ayə)**

İbn əl-Qeyyim demişdir: Peyğəmbəri əsl sevmək ona sözdə, əməldə və əxlaqda tabe olmaqla olur. Bu itaətin mövcudluğu təqdirdə sevgi də olur, güclənəndə güclənir, zəifləndikdə isə zəifləyir. Bu sevgi sevməyi və sevilməyi vacib edir. Bu iki amil bir-birini tamamlamalıdır. Yəni sənin Allahı sevməyin kifayət deyil, gərək Allah da səni sevə. Allah da yalnız sən onun rəsulunu zahirdə və batində sevib, onun dediklərini təsdiqləyib, ona itaət edib, dəvətini qəbul edib, onu başqalarından üstün tutub, onun hökmlərini başqalarının hökmündən öndə tutub, onu bütün məxluqatdan daha çox sevdikdə ola bilər. Əgər belə olmazsa özünü yormağa dəyməz. Geriyə dön və bil ki, heç bir şey əldə etməmisən."

2- Onu çox xatırlamaq və onu görməyi sevmək:

Peyğəmbər ﷺ demişdir: "Ümmətimdən məni ən çox sevənlər o kəslərdir ki, onlar məndən sonra yaşayarlar və məni görmək naminə mallarından və yaxınlarından keçməyə hazır olarlar." İbn əl-Qeyyim demişdir: "İnsan sevdiyini nə qədər çox ansa, qəlbində onun barəsində düşünsə, onun gözəl xüsusiyyətlərini xatırlasa ona olan sevgisi ikiqat artar, onu görmək üçün darıxar və həmin sevgi onun qəlbini əhatələyər. Yox əgər onu xatırlamazsa və onun gözəl xüsusiyyətlərini yada salmazsa ona qarşı bəslədiyi sevgi azalar. Sevən şəxs üçün sevgilisini görməkdən, onun gözəl xüsusiyyətlərini xatırlamaqdan daha

gözəl nə ola bilər ki? Sevgi artıb azaldıqca bunlar da çoxalıb azalar.“

3-Quranı öyrənib ona əməl etmək və onun göstərdiyi əxlaqi keyfiyyətlərə nail olmaq.

Peyğəmbər ﷺ demişdir: “Allahı və Onun rəsulunu sevmək kimi sevindirirsə Quran oxusun.” Abdullah ibn Məsud demişdir: “Allahı və Onun rəsulunu sevmək istəyən kəs baxsın, əgər Quranı sevirsə deməli Allahı və rəsulunu da sevir.“

İbn əl-Qeyyim demişdir: “Quranı aramla, mənalarını düşünərək oxumaqdan daha çox qəlbə xeyirli şey yoxdur. Bu keçib gedənlərin məqamlarını, yaxşı əməl sahiblərinin hallarını və Allahın arif bəndələrinin hallarını özündə cəm edir, qəlbdə məhəbbət, darıxmaq, qorxu, rica, yönəlmək, təvəkkül, razılıq, arxayınlıq, şükür, səbir və digər qəlb üçün lazımlı amillərin yaranmasına və onun kamilləşməsinə səbəb olur. Həmçinin qəlbi xarab və həlak edən bütün pis əməllər də ona mənfi təsir edir. Əgər insanlar Quran oxumağın mahiyyətini dərk edə bilsəydilər başqa bütün əməlləri tərk edib ancaq onunla məşğul olardılar. İnsan qəlbinin şəfa tapması üçün ona lazım olan bircə ayəni yüz dəfə oxuyub hətta onu bütün gecəni təkrar etsə, bu bütün Quranı tez-tez oxumağından daha yaxşıdır. Çünki bu onun qəlbi üçün daha faydalı olar, onun imanını da artırar və o, Qurandan həzz almış olar. Sələflər də adətən belə edər və bir ayəni səhərədək təkrar edərdilər. Belə rəvayət olunmuşdur ki, peyğəmbər ﷺ bu ayəni səhərə qədər təkrarlamışdır: **“Əgər onlara əzab versən, sözsüz ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, şübhəsiz ki, Sən Qüdrətlisən, Müdriksən!“ (əl – Maidə surəsi, 118-ci ayə)**

Əl-qərəz Quranı aramla tilavət etmək qəlbin şəfa tapmasının əsas səbəblərindəndir.

**4- Onun sevdiklərini sevmək, nifrət etdiklərinə isə nifrət etmək.**

Bu barədə bir çox hədislər varid olmuşdur.

Peyğəmbər ﷺ demişdir: “Əlini sevən məni sevmiş, məni sevən isə Allahı sevmiş olur. Həmçinin Əliyə nifrət edən mənə nifrət etmiş, mənə nifrət edən isə Allah nifrət etmiş olur.“ (Səhih hədislər silsiləsi, 1299)

Həmçinin Həsən və Hüseyn barəsində demişdir: “Onları sevən məni sevmiş, onlara nifrət edən isə mənə nifrət etmiş olur.“(Səhih hədislər silsiləsi, 2895)

Həmçinin demişdir: “Məni sevən hər kəs Usaməni də sevsin.“ (Səhih əl-Cami, 5966)

**5– Onun barəsində həddi aşmamaq və onu Allahın ona bəxş etdiyi səviyyədən daha yuxarıya qaldırmamaq.**

Peyğəmbər ﷺ bu barədə buyurmuşdur: “Ey insanlar, məni həddindən yuxarı qaldırmayın. Şübhəsiz ki, Allah məni peyğəmbər seçməmişdən öncə qul buyurmuşdur.“ (Səhih hədislər silsiləsi, 2550) Həmçinin demişdir: “Nəsranilər Məryəm oğlunu şişirtdikləri tək siz də məni şişirtməyin. Şəkk yoxdur ki, mən onun quluyam, odur ki, mənə Allahın qulu və elçisi deyin.“ (əl-Buxari, 3445)

Ənəs ibn Malik rəvayət etmişdir ki, bir dəfə bir kişi belə dedi: Ey Muhəmməd, ey bizim cənabımız və cənabımızın oğlu, ey bizim ən xeyirlimiz və ən xeyirlimizin oğlu! Rəsulullah ﷺ isə belə dedi: “Ey insanlar! Allahdan qorxun ki, şeytan sizi azdırmasın, mən Muhəmməd ibn Abdullaham, mən Allahın qulu və elçisiyəm və istəmirəm ki, məni İzzət və Cəlal sahibinin mənə verdiyi bu səviyyədən daha yuxarı qaldırasınız.“ (Səhih hədislər silsiləsi, 1097)

**6– Bidətlərdən və nəfsin istəklərindən uzaq durmaq.**

Bunu da peyğəmbər ﷺ bir çox hədislərdə buyurmuşdur.

İrbad ibn Sariyə demişdir: Bir gün peyğəmbər bizə namaz qıldırdıqdan sonra üzünü bizlərə tərəf çevirdi və bizə elə bir bəlağətli moizə verdi ki, gözlərimiz yaşardı və qəlblərimiz titrədi. Aramızdan biri dedi: Ey Allahın rəsulu elə bil bu vida moizəsidir, bizə nə buyurursan? O dedi: “Sizə Allahdan qorxmağı və

rəhbəriniz həbəşi bir kölə olsa belə onu eşidib itaət etməyi tövsiyə edirəm. Şübhəsiz ki, aranızdan məndən sonra yaşayanlarınız bir çox ixtilaflar görəcəkdir. Odur ki, mənim və doğru yolda olacaq raşidi xəlifələrimin yolunu tutub gedin və həmin yoldan arxa dişlərinizlə yapışın. Yeniliklərdən isə çəkinin. Çünki hər bir yenilik bidət, hər bir bidət isə zəlalətdir.“ (Əbu Davudun Sünən əsəri, 4609)

**Peyğəmbəri ﷺ düzgün şəkildə sevmək və inlanlar arasında bu məsələdə olan ixtilaf barədə .**

Uca və Nöqsansız Allah öz peyğəmbərini yalnız təsdiqlə deyil, ona qarşı qəlblə, dillə və əməllə edilməsi gərəkən bir sıra hüquqlarla üstün etmişdir. Necə ki Uca Allah Onun varlığını təsdiq etməklə kifayətlənməyərək, bir sıra ibadətləri insanlara vacib etmişdir. Həmçinin yalnız peyğəmbərliyi inkar etməyi deyil, bir sıra əməlləri də haram buyurmuşdur.
Həmin hüquqlardan biri hər bir möminin onu övladından, özündən və hər kəsdən çox sevməsidir ki, Quran və sünnə buna açıq-aşkar dəlalət etmişdir. Bununla hər bir mömin peyğəmbə -rin ﷺ sevdiyi hər şeyi sevməli, onun nifrət etdiyi hər şeyə də kin bəsləməlidir. Onun razı qaldığı şeylərdən razı qalmalı, qəzəbləndiyi şeylərə qəzəblənməlidir. Bütün bu sevgi və nifrət hislərini öz əzaları ilə sübut etməlidir.
İnsanlar bu sevgini müxtəlif cür başa düşüblər və bu məsələ barəsində üç qismə bölünüblər:

**Birinci qism: İfrat əhli.**

Bunlar o kəslərdir ki, onlar peyğəmbəri ﷺ sevmək məsələsində həddi aşmış, Allahın və rəsulunun buyurmadığı şeyləri edərək bunu sevginin əlamətindən hesab etmişlər. Buna misal olaraq peyğəmbərə mövlud yəni ad günü keçirməyi, onu həddindən artıq tərifləməyi və yalnız Allah layiq olan xüsusiyyətlərlə vəsf etməyi, ona dua etməyi, onunla təvəssül

etməyi, şəfa diləməyi, ona and içməyi, qəbrini təvaf etməyi, oraya sürtünmək və bir sıra başqa bidət və şirk əməllərini göstərmək olar. Təəccüblüsü də budur ki, onlar bunu peyğəmbəri ﷺ sevdiklərini iddia edərək həyata keçirirlər. Halbuki bu tip əməlləri Allah və Onun rəsulu buyurmamış və onu hər kəsdən çox sevən səhabələr belə etməmişlər. Hətta şəriət bunu qadağan edərək tam əksini etməyi buyurmuşdur. Belələrinin əksəriyyəti şəriətin qadağa etməsinə məhəl qoymayaraq peyğəmbəri ifratla tərif edən şeir və qəsidələrlə vəsf edirlər. Əslində isə onlar bir çox əməllərində peyğəmbərə ﷺ asi olur və onun dediklərinə riayət etmirlər.

Belələri agah olsunlar ki, peyğəmbəri sevmək ona dua edib yardım diləməklə olmur. Bunlara layiq olan yalnız aləmlərin Rəbbi olan Allahdır və bunu etmək şirk sayılır. Hər şeyi yaradan, ehtiyacı olanın duasını qəbul edən, yaxın olub dualara icabət edən, duaları eşidən yalnız Odur.

**İkinci qism: Təfrit əhli.**

İkinci qism təfrit əhlidir ki, onlar peyğəmbəri ﷺ layiqincə sevməmiş və onun sevgisini mal-dövlət və özünü sevməkdən üstün tutmamışlar. Ona ehtiram göstərməmiş, itaət etməmiş və sünnəsinə tabe olmamışlar. Bunun da aşağıdakı səbəbləri vardır:

**Birinci**: Onlar etdikləri günahlar ucbatından peyğəmbərin ﷺ sünnəsindən üz döndərmiş, nəfslərinin istəklərini və şəhvətlərini halal və haramlardan üstün tutmuşlar.

**İkinci**: Onlar elə zənn edirlər ki, təsdiq etmək iman üçün kifayət edir və onlara vacib olan yalnız budur. Belələri Muhəmmədin ﷺ peyğəmbərliyini təsdiq etməklə kifayətlənir və ona tabe olmağa lüzum görmürlər. Murciələrin məzhəbi də belədir. Onlar əməli imandan hesab etmir və imanın yalnız təsdiqdən və dillə deməkdən ibarət olduğunu deyirlər. Belələri bizim zamanımızda necə də çoxdurlar.

**Üçüncü**: Belələrinin əksəriyyəti dinlərini yaxşıca mənimsəmir, o cümlədən peyğəmbərin ﷺ haqlarını və onu sevməyi bilmirlər. Əfsuslar olsun ki, insanların əksəriyyəti yalnız adda İslama

mənsubdurlar. Bu tip insanlar gərək etdkləri günahlara son verib, etdikləri əməllərdən çəkinsinlər. Onların peyğəmbəri sevmələrinə əsas əngəl günahları və asilikləridir. Həmçinin onlar bilməlidirlər ki, yalnız təsdiq etmək iman sayılmır. İman qəlbdə təsdiq etmək, dillə demək və əzalarla əməl etməyə deyilir. İman Allaha itaət etməklə artır, şeytana uymaqla da azalır. Heç kim əməli imandan kənar hesab edə bilməz. Gərək hər kəs Allaha və Onun rəsuluna iman gətirib onlara tabe olsunlar ki, iman sahibi olsunlar. Tebeçilik imanın tərəzisi hesab olunur. Nə qədər çox tabe olsa imanı da bir o qədər çox olar, azaldıqda da azalar.

Bundan əlavə gərək onlar dini biliklərə, ələlxüsus da özlərinə vacib olanlara yiyələnsin. Həmin məsələlər arasında peyğəmbərin ﷺ hansı haqlara malik olduğu da vardır. Uca Allah peyğəmbərin ﷺ haqlarını bilməyərək onunla ucadan danışanların bu əməlini pisləyərək onları anlamaz kəslər kimi qələmə vermişdir. Uca Allah buyurur: **"Şübhəsiz ki, səni otaqların arxasından səsləyənlərin əksəriyyəti *nə etdiklərini* anlamırlar."**[1]
Elə həmin surədə Uca Allah peyğəmbərin ﷺ haqlarını bilən kəsləri tərif edərək buyurur: **"Həqiqətən, Allahın Elçisi yanında səsini endirənlər o şəxslərdir ki, Allah onların qəlbini təqva üçün sınağa çəkmişdir. Onları bağışlanma və böyük mükafat gözləyir."**[2]

Başqa bir ayədə Rəbbimiz buyurur: **"De: "Heç bilənlərlə bilməyənlər eyni ola bilərmi? *Bundan* ancaq ağıl sahibləri düşünüb ibrət alarlar."**[3]
Hər kəs bilməlidir ki, peyğəmbərə ﷺ tabe olmadan, onun sünnəsinə riayət etmədən və onun yolunu izləmədən nə iman ola bilər, nə də ki, sevgi.[4]

## Üçüncü qism: İfratla təfrit arasında orta mövqe tutanlar.

[1] əl-Hucurat, 4.
[2] əl-Hucurat, 3.
[3] əl-Zumər, 9.
[4] əl-Mufsil fir-raddi alə şubuhət əda əl-İslam əsəri.

Üçüncü qism isə öncə qeyd etdiyimiz iki qism yəni ifratla təfrit arasında orta mövqe tutanlardır. Səhabələr, tabiinlər və onların yolunu tutub gedənlər bu mövqedə olmuşlar. Onlar bu sevginin vacibliyinə bir hökm olaraq iman gətirmiş, həm etiqadda, həm sözdə, həm də əməldə buna riayət etmişlər. Onlar Allah və rəsulunun buyurduğu kimi peyğəmbəri ﷺ övladlarından, yaxınlarından və bütün məxluqatdan, hətta özlərindən belə daha çox sevmişlər. Bu xüsusda Uca Allah buyurur: **"Peyğəmbər möminlərə onların özlərindən daha yaxındır."**[1]

Hətta onlar peyğəmbər ﷺ yolunda mallarını və canlarını belə verməyə hazır olmuşlar. Uca Allah buyurur: **"Mədinə əhalisinə və onların ətrafındakı bədəvilərə *döyüşdə* Allahın Elçisindən geri qalmaq, onun canından öncə öz canlarının hayına qalmaq yaraşmaz."**[2]

Uca Allah öz elçisinə əmr etdiyi kimi onlar da ifrata və təfritə varmadan peyğəmbəri ﷺ layiqincə həm etiqadda, həm sözdə, həm də əməldə sevmiş, onun peyğəmbərliyinə iman gətirərək rəbbindən gətirdiyi xəbərləri təsdiqləmişdilər. İmkanları çərçivəsində onlar peyğəmbərə itaət etmiş, əmrlərinə tabe olmuş, əməllərinə, sünnətinə və imandan hesab olunan digər məsələlərə tabe olmuşdular. Uca Allah buyurur: **"Peyğəmbər sizə nə verirsə, onu götürün, nəyi də qadağan edirsə, ondan çəkinin."**[3]

Onlar Nöqsansız və Uca Allahın buyurduğu kimi təsdiq etməklə kifayətlənməyərək onun artığını etmişlər. Həmin məsələlərdən biri onların peyğəmbərə ﷺ salavat və salam deməleridir. Uca Allah buyurur: **"Doğrudan da, Allah və Onun mələkləri Peyğəmbərə xeyir-dua verirlər. Ey iman gətirənlər! Siz də ona xeyir-dua verib kamil ədəb-ərkanla salamlayın."**[4]

Peyğəmbərə ﷺ hörmət və ehtiram göstərmələri də buna aiddir.

---

[1] əl-Əhzab, 6.
[2] ət-Tövbə, 120.
[3] əl-Həşr, 7.
[4] əl-Əhzab, 56.

Uca Allah buyurur: ***“Biz belə etdik*** **ki, siz Allaha və Onun Elçisinə iman gətirəsiniz, ona kömək edəsiniz, onun hörmətini saxlayasınız və gecə-gündüz** ***Allahı*** **təriflәyәsiniz.” (əl-Fəth, 9)**

Peyğəmbərə ﷺ yardım etmək onu dəstəkləməklə və ona əziyyət verən şeylərin qarşısını almaqla olur.

Ona hörmət etmək isə ona ikram və ehtiram etməklə, habelə onunla ədəb-ərkanla danışmaqla olur.

Uca Allah buyurur: **”Peyğəmbəri, öz aranızda bir-birinizi çağırdığınız kimi çağırmayın.”**[1]

Beləcə Rəbbimiz insanlara peyğəmbərin ﷺ icazəsi olmadan danışmağı, səsini onun səsindən ucaltmağı, bir-birilərini çağırdığı kimi onu çağırmağı qadağan etmişdir.

Uca Allah buyurur: **”Ey iman gətirənlər!** ***Heç bir şeydə*** **Allahı və Onun Elçisini qabaqlamayın. Allahdan qorxun! Həqiqətən, Allah Eşidəndir, Biləndir. Ey iman gətirənlər! Səsinizi Peyğəmbərin səsindən yüksəyə qaldırmayın və bir-birinizə müraciət etdiyiniz kimi ona da uca səslə müraciət etməyin. Yoxsa, özünüz də hiss etmədən əməlləriniz hədər gedər. Həqiqətən, Allahın Elçisi yanında səsini endirənlər o şəxslərdir ki, Allah onların qəlbini təqva üçün sınağa çəkmişdir. Onları bağışlanma və böyük mükafat gözləyir.”**[2]

Onlar Uca Allahın əmrlərinə tabe olaraq özlərinə fərz buyurulmuş bir çox qeyd etmədiyimiz hüquqlara riayət etmişlər. Eyni zamanda onlar özlərinə buyurlmuş məsələlərdə ifrat əhli kimi həddi aşmamışlar. İfratçılar peyğəmbərə ﷺ Allaha məxsus vəsflər vermiş, onun qeybi bildiyini iddia etmiş, ona dua və səcdə etmiş, ondan yardım diləmiş və qəbrinin ətrafında təvaf etmişlər. Onlar bilirlər ki, Uca Allahın peyğəmbəri ﷺ ucaltması, şərəfləndirməsi və dəyərləndirməsi onu insanlıqdan çıxarmır. Uca Allah buyurur: **“De: “Rəbbim pak və müqəddəsdir! Mən isə yalnız elçi** ***göndərilmiş*** **bir insanam.”**[3]

Onlar yəqinliklə bilirlər ki, peyğəmbəri Allaha məxsus sifətlərlə vəsf etmək onun sevgisi ilə ziddiyyət təşkil edir və onu yox edir. Uca Allah peyğəmbərinə ﷺ əmr etmişdir ki ümmətinə

[1] ən-Nur, 63.
[2] əl-Hucurat, 1-3.
[3] əl-İsra, 93.

bunları desin: “**De: “Mən Allahın istədiyindən başqa özümə nə bir fayda, nə də bir zərər yetirməyə qadir deyiləm. Əgər qeybi bilsəydim, əlbəttə, *özüm üçün* xeyir artırardım və mənə pislik toxunmazdı. Mən sadəcə, iman gətirən bir qövm üçün qorxudan və müjdələyənəm”[1]**

Həmçinin buyurur: **“De: “Allahdan başqa göylərdə və yerdə olanların heç biri qeybi bilməz. Onlar nə zaman diriləcəklərini belə bilmirlər.”[2]**

Beləcə peyğəmbər ﷺ barəsində hər hansı formada ifrata varmaq onu sevməkdən irəli gəlmir. Əksinə bu tip əməllər peyğəmbərə müxalif olmaq hesab olunur və ondan çəkinmək və başqalarını da bunun əzabından çəkindirmək lazımdır. Uca Allah buyurur: **“Qoy onun əmrinə qarşı çıxanlar başlarına bir bəla gəlməsindən, yaxud özlərinə ağrılı-acılı bir əzab üz verməsindən qorxsunlar.”[3]**

Həmçinin bu əməl peyğəmbərə ﷺ qarşı çıxmaq sayılır. Uca Allah bu xüsusda buyurur: **“Hər kəs özünə doğru yol bəlli olduqdan sonra Peyğəmbərə qarşı çıxsa və möminlərin yolundan başqa bir yolla getsə, onu üz tutduğu yola yönəldər və Cəhənnəmdə yandırarıq. Ora nə pis dönüş yeridir.”[4]**

Ona görə peyğəmbər ﷺ barəsində ifrata varanardan uzaq olmaq gərəkdir. Çünki onların etdikləri əməlləri nə Allah öz kitabında buyurub, nə də peyğəmbəri ﷺ buna göstəriş vermişdir. Əksinə bu əməlləri Allah və rəsulu qadağan etmişdir.[5]

Deməli orta mövqedə olanlar heç də peyğəmbərin ﷺ şəninə əksiklik gətirmirlər. Onlar bu sevgi və ehtiramın davamlı olması üçün bütün güclərini səfərbər edirlər.

Bu da orta mövqedə olanların yoludur. Kim onların yolu ilə getmək istəirsə iman əhlinin yəni Quran və Sünnənin yolunda olmalıdır. Bu haqq yoludur. Haqq yolu isə tabe olunmağa daha layiqli yoldur.

---

[1] əl-Əraf, 188.
[2] ən- Nəml, 65.
[3] ən-Nur, 63.
[4] ən Nisa, 115.
[5] Əs-Sarimul Məslul əsəri , 422-ci səh.

Bu yol sələfin, o cümlədən səhabələrin, tabiinlərin və Qiyamətədək onların yolunu tutub gedənlərin yoludur. Onlar peyğəmbəri ﷺ yalnız Quran və Sünnənin buyurduğu kimi sevirdilər. Şəriət nəyi buyurursa onu götürür, nəyi qadağan edirdisə ondan çəkinirdilər. Onlar bu sevgiyə ifrat əhli tək öz rəy və istəkləri ilə yaxınlaşmamışlar. İfrat əhli isə onlardan fərqli olaraq öz istəklərinə uymuş və beləcə yollarını azmışdılar. Bunu isə Uca Allah buyurmamış, şəriətin dəlilləri isə bunun haram olmasını bildirmişdir. Uca Allah ifrat əhlini vəsf edərək buyurur: **"Allahdan bir doğru yol göstəricisi gəlməyincə öz nəfsinin istəyinə uyandan daha çox azmış kim ola bilər?! Şübhəsiz ki, Allah zalım adamları doğru yola yönəltməz."**[1]

Bu məsələnin xülasəsi ondan ibarətdir ki, Peyğəmbəri ﷺ düzgün şəkildə sevmək ümmətin sələflərinin, o cümlədən səhabələrin, tabiinlərin və onların ardıcıllarının əməlinə uyğun olmalıdır. Çünki onlar həmin sevgi anlamına Quranın ayələrində və sünnədə göstərildiyi tək riayət etmiş və bundan azacıq belə o yana keçməmişdilər.[2]

## Peyğəmbərin ﷺ əhli beytini sevmək.

Hər birimizin peyğəmbərin ﷺ pak əhli beytini sevməsi, onlara ehtiram göstərməsi vacibdir. Uca Allah öz kitabında onları tərifləyərək buyurur: **"Ey ev əhli! Allah sizdən günahınızı silib aparmaq və sizi tərtəmiz etmək istəyir."**[3]

Əhli beyt deyildikdə özlərinə sədəqə verilməsi haram buyurulmuş peyğəmbərin ﷺ yaxınları nəzərdə tutulur. Onlar da aşağıdakılardır: Əli ؓ və onun ailəsi, Aqil ؓ və onun ailəsi, Cəfər ؓ və onun ailəsi, Abbas ؓ və onun ailəsi.

Əhli beyt arasında ən üstün olanlar isə örtük altında olanlardır. Səhih bir hədisdə bildirilir ki, bir dəfə peyğəmbər ﷺ

---

[1] əl- Qəsəs, 50.
[2] əl-Mufassal fir-raddi alə şubuhət əda əl-İslam əsəri.
[3] əl-Əhzab, 33.

Həsəni, Hüseyni, Fatiməni və Əlini yanına çağıraraq onları öz əbasının altına alıb demişdi: “Bunlar mənim əhli beytimdir, bunlar daha layiqdirlər.”[1]

Həmçinin peyğəmbər ﷺ öz ümmətinə əhli beytə qarşı ehtiram göstərməyi tövsiyə edərək demişdir: “Ey insanlar, şübhəsiz ki, mən bir insanam, ola bilsin ki Allahın rəsulu (mənim canımı almaq üçün) gəlsin mən də onun çağırışına cavab verim. Özümdən sonra sizlərə iki şeyi qoyub gedirəm. Onlardan birincisi Allahın kitabıdır, orada hidayət və nur vardır. Allahın kitabını götürüb ondan möhkəmcə yapışın.” Peyğəmbər ﷺ beləcə insanları Allahın kitabına təşviq etdikdən sonra dedi: “Bir də əhli beytim, əhli beytimi unutmayın”[2]

Möminlərin anaları, peyğəmbərin ﷺ pak zövcələri də əhli beytdən sayılır.

Şeyxul İslam İbn Teymiyyə demişdir: “Bizlərə görə əhli beyti sevmək fərz və vacibdir. Onları sevən əcr qazanmış olur. Muslimin səhih əsərində Zeyd ibn Ərqamdan rəvayət olunur ki; Bir dəfə peyğəmbər Məkkə ilə Mədinənin arasında Xum adlanan bir dərədə bizlərə xütbə verərək dedi: “Ey insanlar, Sizlərə iki şeyi qoyub gedirəm, Allahın kitabı”. O, bunu deyərək Allahın kitabını xatırlatdı və insanları ona təşviq etdi, sonra dedi:” Bir də mənim yaxınlarım olan əhli beytim, əhli beytimi sizə xatırladıram, əhli beytimi sizə xatırladıram.” Mən Muqaddimə dedim: Biz hər gün namazlarımızda deyirik ki; “Allahım! Məhəmmədə və onun ailəsinə də İbrahimə və onun ailəsinə xeyir-dua verdiyin kimi xeyir-dua ver! Sən həqiqətən alqışlara layiq və şan-şövkətlisən! Məhəmmədə və onun ailəsinə də İbrahimə və onun ailəsinə bərəkər verdiyin kimi bərəkət ver! Sən həqiqətən alqışlara layiq və şan-şövkətlisən!” Muqaddəm dedi: belə olduğu halda Əhli beytə kim nifrət bəsləyə bilər? Mən dedim: Onlara nifrət bəsləyənə

[1] Hədisi İmam Əhməd səhabələin fəzilətində qeyd etmişdir, 2/577-578.
[2] Muslim, 6378.

Allahın, mələklərin və bütün inanların lənəti olsun, Allah ondan heç bir əməli qəbul etməz ...” [1]

Şeyx İbn Üseymin demişdir: Peyğəmbərin əhli beytini sevmək Əhli sünnə vəl cəmaanın əsaslarındandır. Onar iki şeyə görə əhli beyti sevirlər: İmanlarına görə, bir də peyğəmbərin yaxınları olduqlarına görə. Həmçinin onlara əsla nifrət bəsləməzlər ...

Bizlər də öz növbəmizdə deyirik: Ey Rəbbimiz şahid ol ki, biz peyğəmbərin əhli beytini və yaxınlarını sevirik. Biz Allahı və Onun rəsulunu sevdiyimiz üçün onları da sevirik.

Qeyd etdiyimiz kimi Qurani Kərimdə də bildirilir ki peyğəmbərin xanımları da əhli beytdəndirlər.

Həmçinin peyğəmbərin qohumları da əhli beyt sayılır, Misal üçün: Əli, Fatimə, Həsən, Hüseyn, Abbas ibn Əbdül Muttalib və başqaları kimi.

Peyğəmbərin qohumarından kafir olanlara gəlincə biz həmin qohumluğa rəğmən onları sevmirik. Məsələn: Peyğəmbərin əmisi Əbu Ləhəbi heç bir vəchlə sevmək olmaz. Əksinə o, kafir olduğu və peyğəmbərimizə əziyyət vetdiyi üçün biz ona nifrət etməliyik. Həmçinin Əbu Talibə də gərək nifrət edək, çünki kafir idi. Biz yalnız onun bəzi yaxşı əməllərini, o cümlədən peyğəmbəri himayə etməsi və onu qoruması kimi əməllərini sevə bilərik.[2]

## Peyğəmbərin səhabələrini sevmək

Peyğəmbərin səhabələrini sevmək də onu sevməyə daxildir.

əl-Beyhəqi demişdir: “Peyğəmbərin səhabələrini sevmək də onu sevməyə daxildir. Çünki Uca Allah onları tərifləyərək buyurur: “**Muhəmməd Allahın Elçisidir. Onunla birlikdə olanlar kafirlərə qarşı sərt, öz aralarında isə mərhəmətlidirlər. Sən onları rüku edən, səcdəyə qapanan, Allahdan lütf və razılıq diləyən**

[1] Məcmu fətava İbn Teymiyyə, 8/68.
[2] Məcmi əl-fətava, 8/309-310.

**görərsən. Əlamətləri isə üzlərində olan səcdə izidir. Bu onların Tövratdakı vəsfidir. İncildə isə onlar elə bir əkin kimi vəsf olunurlar ki, bu (əkin) cücərtisini üzə çıxarıb onu qüvvətləndirmiş, o da getdikcə qalınlaşıb gövdəsi üstündə şax duraraq əkinçiləri heyran etmişdir. (Allah möminlərin sayını artırır, özlərini də qüvvətləndirir) ki, kafirləri qəzəbləndirsin. Allah onlardan iman gətirib yaxşı işlər görənlərə bağışlanma və böyük bir mükafat vəd etmişdir."**[1]

Başqa bir ayədə isə buyurur: "**Möminlər (Hüdeybiyyədə) ağac altında sənə beyət edərkən Allah onlardan razı qaldı. (Allah) onların qəlbində olanı bildi, onlara (mənəvi) rahatlıq nazil etdi və onları yaxın bir zəfərlə mükafatlandırdı."**[2]

Həmçinin buyurur: "**Dində hamını ötüb keçən ilk mühacirlərə və ənsarlara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedənlərə gəlincə, Allah onlardan razıdır, onlar da Ondan razıdırlar. (Allah) onlar üçün (ağacları) altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları hazırlamışdır. Bu, böyük uğurdur."**[3]

Həmçinin buyurur: "**İman gətirən, hicrət edən və Allah yolunda cihad edənlər və sığınacaq verib köməklik göstərənlər – məhz onlar həqiqi möminlərdir. Onlar üçün bağışlanma və bolluca ruzi vardır."**[4]

Əgər onlar həqiqətən də bu sadalanan məqamlara layiqdirlərsə o zaman hər bir müsəlmanın onları sevməsi və onları sevməklə Allaha yaxınlaşması vacibdir. Çünki Uca Allah birisindən razı qaldıqda onu sevir, hər bir insanın da Rəbbinin sevdiyi kəsi sevməsi vacibdir."[5]

Beləcə hər bir müsəlmana peyğəmbərin səhabələrini sevməsi, onlardan razı qalması və onlar üçün dua etməsi vacibdir. Uca Allah bunu bizlərə əmr edərək buyurur: "**(Səhabələrdən)**

[1] əl-Fəth, 29.
[2] əl-Fəth, 18.
[3] ət-Tövbə, 100.
[4] əl-Ənfal, 74.
[5] əl-Beyhəqinin əş-Şuəbul iman əsəri, 1/287.

**sonra gələnlər deyirlər: "Ey Rəbbimiz! Bizi və bizdən əvvəlki iman gətirmiş qardaşlarımızı bağışla. Bizim qəlbimizdə iman gətirənlərə qarşı nifrət və həsədə yer vermə. Ey Rəbbimiz! Həqiqətən də, Sən Şəfqətlisən, Rəhmlisən!"**[1]

Onlar elə insanlardır ki, Uca Allah bu dünyada onları bir çox xüsusiyyətlərlə digər insanlardan üstün etmişdir. Onlar peyğəmbəri öz gözləri ilə görmüş, hədislərini bilavasitə onun mübarək dilindən eşitmiş, ona dayaq olmuş, onu qorumuş və İslamın yayılması naminə onunla birlikdə Allah yolunda cihad etmişlər.

Peyğəmbər vəfat etdikdən sonra isə onunla ümməti arasında vasitəçi olmuşlar. Onlar peyğəmbərin gətirdiyi hidayət və nuru layiqincə təbliğ etmiş və İslamı yer üzərində yaymışlar. Onlar malları və canları ilə Allah yolunda cihad etmiş, bu dini dilləri və canları vasitəsilə qorumuşlar. Məhz bu səbəblərə görə onlar həm peyğəmbərləri, həm də tövhid əhli yanında böyük əcrə və yüksək məqama layiq olmuşlar.

Başqa cür ola da bilməz, çünki peyğəmbər onların ən xeyirli insanlar olduqlarını bildirmişdir.

İmran ibn Husayn peyğəmbərin belə dediyini rəvayət etmişdir: "Ən xeyirliləriniz mənim zamanımdakılardır, sonra onlardan sonra gələnlər, sonra da onlaran sonra gələnlər."[2]

Abdullah ibn Məsuddan peyğəmbərin belə dediyi rəvayət olunur: "İnsanların ən xeyirlisi mənim zamanımdakılardır, sonra onlardan sonra gələnlər, sonra da onlardan sonra gələnlər..."[3]

Səhabələrin fəzilətinə və yüksək məqama layiq olmalarına aşağıdakı hədisi də dəlil göstərmək olar: Əbu Səid əl-Xudridən peyğəmbərin belə dediyi rəvayət olunur: "Mənim səhabələrimi söyməyin, canım Əlində olana and olsun ki, sizlərdən biriniz Uhud

---

[1] əl-Həşr, 10.
[2] əl-Buxari, 2651, Muslim, 6638.
[3] əl-Buxari, 2652, Muslim, 6635.

dağı qədər sədəqə vermiş olsa belə onlardan birinin verdiyi bir ovuc, hətta yarım ovuc belə sədəqəyə çata bilməz."[1]
Ənəs ibn Malikdən peyğəmbərin belə dediyi rəvayət olunur: "Ənsarı sevmək imanın, onlara nifrət bəsləmək isə nifaqın əlamətidir."[2]

Səhabələrin fəzilətləri və onların ən əfzəl insanlar olmaları barədə saysız hesabsız hədislər vardır. Həmin hədislər bir daha peyğəmbərdən sonra ən xeyirli insanlar olan səhabələrə ehtiram bəsləməyin, onları sevməyin vacibliyini göstərir.
Buxari, Muslim, habelə "Sünən" əsərlərinin müəllifləri öz əsərlərində səhabələrin fəzilətləri barədə xüsusi bir fəsil ayırmış və həmin fəsillərdə səhabələrin fəziləti barədə çoxlu hədislər qeyd etmişlər.

Əbu Zura ər-Razi sələfin səhabələr barəsində etiqadı haqqında demişdir: "Əgər görsən ki, birisi peyğəmbərin səhabələrindən biri barədə nalayiq ifadə işlədir bil ki, həmin şəxs münafiqdir. Çünki həm peyğəmbər, həm də onun gətirdikləri haqdır. Bütün bunları bizə çatdıranlar isə məhz səhabələr olmuşdur. Belələri Quran və Sünnəni batil hesab etmək istəyərək bizim dahilərimizi gözdən salmaq istəyirlər. Əslində isə hər bir nalayiq söz onların özləri haqqında deyilməlidir və onlar münafiqdirlər."[3]
Xatib əl-Bağdadi demişdir: "Səhabələrin mötəbər şəxslər olmaları sabitdir. Uca Allahın onların pak olmalarını bildirməsi, Quranda onlara yer verməsi buna əsl sübutdur.

Uca Allah buyurur: **"Siz insanlar arasında üzə çıxarılmış ən xeyirli ümmətsiniz."[4]**

Həmçinin buyurur: **"Beləliklə Biz sizi orta bir ümmət etdik ki, siz insanlara şahid olasınız, peyğəmbər də sizə şahid olsun."[5]**

---

[1] əl-Buxari, 3673, Muslim, 6651.
[2] əl-Buxari, 3784, Muslim, 244.
[3] əl-Kifayə fi ilmir-rivayə, 97 səh.
[4] Ali İmran, 110.
[5] əl-Bəqərə, 143.

Bu ayələr ümumi qeyd olunsa da xüsusi olaraq səhabələrə şamil olunur. Hətta bəziləri bu ayələrdə yalnız səhabələrin qəsd edildiklərini vurğulamışlar.

Həmçinin buyurur: **“Möminlər (Hüdeybiyyədə) ağac altında sənə beyət edərkən Allah onlardan razı qaldı. (Allah) onların qəlbində olanı bildi, onlara (mənəvi) rahatlıq nazil etdi və onları yaxın bir zəfərlə mükafatlandırdı.”**[1]

Həmçinin buyurur: **“Dində hamını ötüb keçən ilk mühacirlərə və ənsarlara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedənlərə gəlincə, Allah onlardan razıdır, onlar da Ondan razıdırlar. (Allah) onlar üçün (ağacları) altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları hazırlamışdır. Bu, böyük uğurdur.”**[2]

Həmçinin buyurur: **“(Xeyirxahişlərdə) öndə gedənlər, (Cənnətdə də) öndədirlər! Onlar (Allaha) yaxın olanlar, Nəim bağlarında (qalacaq kimsələrdir).”**[3]

Həmçinin buyurur: **“Ey Peyğəmbər! Sənə və sənin ardınca gedən möminlərə Allah kifayət edər.”**[4]

Həmçinin buyurur: **“(Qənimət həmçinin) yurdlarından qovulmuş və mallarından məhrum olunmuş yoxsul mühacirlərə məxsusdur. Onlar Allahın mərhəmətini və razılığını qazanmağa can atır, Allaha və Onun Elçisinə kömək edirlər. Doğru olanlar da məhz onlardır. (Mühacirlərdən Mədinədə) əvvəl (orada) yurd salmış və iman gətirmiş kimsələr öz yanlarına hicrət edənləri sevir, onlara verdiklərinə görə qəlblərində peşmançılıq hissi duymurlar. Hətta özləri ehtiyac içində olsalar belə, onları özlərindən üstün tuturlar. Nəfsinin tamahından qorunan kimsələr nicat tapanlardır.”**[5]

Bu barədə bir çox ayələr vardır ki, onların da hamısını burada sadalaya bilərik.

---

[1] əl-Fəth, 18.
[2] ət-Tövbə, 100.
[3] əl-Vaqiə, 10-12.
[4] əl-Ənfal, 64.
[5] əl-Həşr, 8-9.

Allahın elçisi də səhabələrini vəsf edərək onları təqdir etmiş və tərifləmişdir.

Bütün bu dəlillər səhabələrin paklığını, mötəbər şəxslər olduqlarını açıqlayır. Onların batinlərinə bələd olan Allah özü onları tərif edirsə başqalarının sözlərinə əhəmiyyət verilməz. Hətta Allah və rəsulu səhabələr barədə bütün bu tərifləri verməmiş olsaydı belə onların etdikləri hicrət, cihad, peyğəmbərə dəstək, mal-dövlətlərini xərcləmələri, öz atarına və övladlarına qarşı çıxmaları, dini yaymaları, güclü imana və yəqinliyə sahib olmaları onların bütün insanlardan daha mötəbər və pak şəxsiyyət olmaları üçün kifayət olardı. Bütün alimlərin və sayılan fəqihlərin mövqeyi belədir."[1]

İbn Həcər demişdir: "Sünnə əhlinin yekdil rəyinə görə bütün səhabələr etimad olunan şəxslərdir. Yalnız bəzi bidətçilər buna müxalif mövqe nümayiş etdirmişlər."[2]

Təhaviyə əqidəsi əsərinin müəllifi demişdir: "Bizlər peyğəmbərin səhabələrini ifrata varmadan sevirik, onların heç birindən uzaqlaşmırıq. Əksinə onlara nifrət edib barələrində nalayiq ifadələr işlədənlərə biz nifrət edirik. Səhabələr dini və yaxşı əməlləri sevib küfr və asiliyə nifrət bəslədiklərinə görə biz onlar haqqında yalnız xeyir söz söyləyirik."[3]

əl-Beyhəqi demişdir: "Beləliklə aydın oldu ki, səhabələri sevmək imandandır. Onları sevmək isə onların fəzilətlərinə etiqad etməklə, hər birinin haqqını verməklə, İslama xidmək göstərənin xidmətini etiraf etməklə, peyğəmbərin ﷺ yanında xüsusi hörmətə layiq olanın yerini biməklə olur. Hər bir müsəlman gərək onların yaxşı əməllərini yayaraq onlar haqqında xeyir söyləsin və onlardan nəql olunan dini məsələlərə riayət etsin. Həmçinin gərək onların buraxduqları səhvləri arayıb araşdırmasın və belə məsələləri yaymasın, habelə onların arasında baş vermiş məsələlər barədə

---

[1] əl-Kifayə fi ilmir-rivayə, 93-96-cı səh.
[2] əl-İsabə, 1/17.
[3] Şərh əqidətut Tahaviyyə, 528-ci səh.

zərurət olmadan danışmasın. Şübhəsiz ki, müvəffəqiyyət Allahdandır."[1]

Şeyxul İslam İbn Teymiyyə demişdir: "Əhli Sünnənin əsaslarındandır ki, onlar dillərini və qəlblərini peyğəmbərin səhabələri barədə təmiz tuturlar. Uca Allah onları vəsf edərək buyurur: "**(Səhabələrdən) sonra gələnlər deyirlər: "Ey Rəbbimiz! Bizi və bizdən əvvəlki iman gətirmiş qardaşlarımızı bağışla. Bizim qəlbimizdə iman gətirənlərə qarşı nifrət və həsədə yer vermə. Ey Rəbbimiz! Həqiqətən də, Sən Şəfqətlisən, Rəhmlisən!"[2]**
Həmçinin peyğəmbər ﷺ demişdir: "Mənim səhabələrimi söyməyin, canım Əlində olana and olsun ki, sizlərdən biriniz Uhud dağı qədər sədəqə vermiş olsa belə onlardan birinin verdiyi bir ovuc, hətta yarım ovuc belə sədəqəyə çata bilməz."[3]

Onlar Quran, Sünnə və icmaya görə səhabələrin fəzilətləri barədə varid olan bütün xəbərləri qəbul edir, səviyyələrinə görə onları fərqləndirirlər. Məsələn Fəthdən - yəni Hüdeybiyyə sülhündən - öncə iman gətirib vuruşanlarla ondan sonra iman gətirib döyüşənləri bir-birindən fəqrləndirir, mühacirləri ənsardan üstün tutur, Uca Allahın rəsulullahın dili ilə Bədr döyüşündə iştirak edənlərə (üç yüz on üç nəfərə): "Nə istəyirsinizsə edin, artıq sizi bağışlamışam."[4] - deməsinə inanırlar. Həmçinin iman gətirirlər ki, Uca Allah ağac altında beyət edən səhabələrdən (min dörd yüz nəfərdən artıq səhabə) razı qalmışdır, onlar da Allahdan razı qalmışlar. Peyğəmbər ﷺ səhabələrdən (on nəfər Cənnətlə müjdələnmiş səhabələr kimi) hansını Cənnətlə müjdələmişsə onlar da buna etiqad edirlər. Həmçinin onlar Əli İbn Əbu Talibin və başqalarının dedikləri və sahəbələrin yekdilliklə qəbul etdikləri kimi; peyğəmbərdən sonra ümmətin ən xeyirlisinin Əbu Bəkr, sonra Ömər, üçüncü Osman, dördüncü isə Əli olduğuna etiqad

---

[1] Şuəb əl-iman, 297-ci səh.
[2] əl-Həşr, 10.
[3] əl-Buxari, 3673; Muslim, 6651.
[4] əl-Buxari, 3983; Muslim, 6557.

edirlər... Eyni zamanda Sünnə əhli səhabələrə nifrət bəsləyib onları təhqir edən Rafizilərin yolundan uzaqdadırlar."[1]

**Səhabələrin peyğəmbəri ﷺ sevmələrinə dair bəzi dəlillər.**

- Aişə ﵂ demişdir: "Peyğəmbərin səhabələri bir yerə toplandıqda onların sayı otuz səkkiz idi. Bu vaxt Əbu Bəkr çölə çıxaraq dəvət aparmağa israr etdi. Peyğəmbər ﷺ dedi: "Ey Əbu Bəkr, bizim sayımız azdır. Əbu Bəkr isə israr etməkdə davam etdi. Sonda peyğəmbər ﷺ buna razılıq verdi və səhabələr məscidin ətrafına yayıldılar və öz yaxınlarının yanına getdilər. Əbu Bəkr isə xütbə verdi. Həmin vaxt Rəsulullah ﷺ oturmuşdu. Beləcə Əbu Bəkr, Allaha və Onun rəsuluna çağıran ilk xütbəni vermiş oldu. Bu vaxt müşriklər Əbu Bəkrin və digər səhabələrin üzərinə cumaraq onları məscidin kənarında möhkəmcə döyməyə başladılar. Əbu Bəkr də həmin vaxt bərk döyülmüşdü. Fasiq Ütbə ibn Rabiə ona yaxınlaşaraq yamanmış sandalları ilə onun üzünə, təpiklə isə qarnına möhkəm zərbələr endirməyə başladı. Ta o vaxtadək ki, Əbu Bəkrin üzü ilə burnu görünməz hala düşdü. Həmin vaxt Teym oğulları gələrək Əbu Bəkri müşriklərin əlindən alıb evinə apardılar. Sonra onlar məscidə qayıdaraq dedilər ki, vallahi ki, əgər Əbu Bəkrə bir şey olsa Ütbə ibn Rabiəni qanına qəltan edəcəyik. Onlar bunu deyib Əbu Bəkrin yanına döndülər. Orada Əbu Quhafə ilə birlikdə Əbu Bəkri ayıltmağa səy göstərdilər. Nəhayət günortanın sonu Əbu Bəkr danışmağa başladı. Onun ilk sözü: Peyğəmbər necədir? - oldu. Onlar onu sakitləşdirdilər. Sonra qalxıb anası Ummu Xeyrə dedilər: Gör ona bir şey yedirdib içirdə bilərsənmi? Anası ona yaxınlaşmaq istədikdə Əbu Bəkr yenə dedi: Peyğəmbər necədir? Peyğəmbərə nə olub? O dedi: Vallahi ki, sənin dostundan bixəbərik. Əbu Bəkr dedi: Get Ummu Cəmil bint Xəttabın yanına və ondan bir xəbər öyrən. O da çıxıb Ummu Cəmilin yanına gəlib

[1] Məcmu əl-fətava, 3/152-153; Məvsuatud-difa ən rasulilləh, 4/299-302.

dedi: Əbu Bəkr Muhəmməd ibn Abdullah haqqında soruşur? O dedi: Nə Əbu Bəkrdən, nə də Muhəmməd ibn Abdullahdan bir xəbərim yoxdur. İstəyirsən səninlə birlikdə oğlunun yanına gedim? O: Bəli - deyə cavab verdi. Ummu Cəmil gəlib Əbu Bəkri ağır vəziyyətdə yerə sərilmiş halda gördükdə fəryad qopararaq dedi: Vallahi ki, sənin başına bunları gətirənlər küfr və üsyan əhlidir. Allahdan sənin intiqamını onlardan almasını diləyirəm. Əbu Bəkr yenə soruşdu: Peyğəmbər necədir? Ummu Cəmil dedi: Anan buradadır, qoy o desin. Əbu Bəkr dedi: Sənin onunla işin yoxdur. Ummu Cəmil dedi: Sağ və salamatdır. Əbu Bəkr yenə soruşdu: O, haradadır? Dedi: İbn əl-Ərqamın evində. Əbu Bəkr dedi: Allaha and olsun ki, peyğəmbərin yanına getməyincə yemək-içməyə dilimi də vurmayacağam. Onlar Əbu Bəkri sakitləşdirməyə başladılar. Sonra onun qollarına girərək peyğəmbərin yanına apardılar. Peyğəmbər ﷺ onu gördükdə üstünə atılaraq öpməyə başladı. Müsəlmanlar da onun üstünə atıldılar. Peyğəmbər onun halına çox acıdı. Əbu Bəkr isə belə dedi: Atam-anam sənə fəda olsun, ey Allahın rəsulu, o fasiqin üzümə endirdiyi bu zərbələrdən savayı heç bir üzüntüm yoxdur. Bu anam Burra, bu da onun atasıdır. Şübhəsiz ki sən mübarək bir şəxssən. Alaha dua et, bəlkə Allah sənin sayəndə onu oddan xilas etdi. Peyğəmbər ﷺ onun üçün dua etdi, o da İslamı qəbul etdi."[1]

- Bir dəfə Ömərin ؓ yanında Əbu Bəkrdən ؓ söhbət düşərkən o, ağlamağa başlayır və deyir: Kaş ki, mənim bu vaxta qədər etdiyim bütün əməllər onun etdiyi bir əmələ, keçirdiyi bir gecəyə bərabər olaydı. Keçirdiyi gecəyə gəlincə peyğəmbərlə ﷺ birlikdə mağaraya sığındığı gecədir. Onlar mağaraya çatdıqda Əbu Bəkr belə demişdi: Vallahi ki, məndən qabaq içəri daxil olmağına imkan verməərəm. Qoy orada bir şey varsa birinci mənə xətər yetirsin. Bunu deyib o mağaraya daxil oldu və içərini təmizləməyə başladı. Birdən o, yan tərəfdə deliklər gördü və libasını cıraraq həmin dəlikləri örtdü. Yalnız iki dəlik qaldı ki, onların da üzərinə

[1] əl-Bidayə vən-nihayə əsəri, 3/29-30.

ayaqlarını qoydu. Sonra peyğəmbərə ﷺ : gəl – dedi. Peyğəmbər ﷺ içəri daxil oldu və başını Əbu Bəkrin qucağına qoyaraq yatdı. Birdən həmin dəliklərdən nə isə Əbu Bəkrin ayağını sancdı. O isə peyğəmbəri ﷺ narahat etməmək üçün yerindən tərpənmədi. Onun göz yaşları peyğəmbərin üzünə düşdükdə o, dedi: “Sənə nə olub, ey Əbu Bəkr?”
Əbu Bəkr ﵁ dedi: Atam-anam sənə qurban, məni nə isə sancdı. Peyğəmbər ﷺ həmin yerə tüpürdü və onun ağrıları getdi.”[1]

- Rəvayət olunur ki, Cabir ibn Abdullah ﵁ demişdir: Bir dəfə biz döyüşdə idik. (Hədisin ravilərindən olan Sufyan həmin döyüşün Bəni Mustaliq döyüşü olduğunu bildirmişdir.) Birdən mühacirlərdən biri ənsarlardan birini vurdu. Bundan sonra həmin mühacir: ey mühacirlər, ənsar isə: ey ənsarlar – deyə çağırmağa başladı. Peyğəmbər ﷺ bunu eşidərək dedi: “Bu nə cahiliyyət çağırışlarıdır?!” Dedilər ki; Mühacirlərdən bir, bir nəfər ənsarı vurub. Rəsulullah ﷺ dedi: “Belə çağırışlar etməyin, bu çox iyrəncdir.” Abdullah ibn Ubey ibn Səlul xəbərdən hali olduqda dedi: Axır ki bunu etdilər, Allaha and olsun ki, Mədinəyə qayıtdıqda aramızda güclü olanlar zəif olanları çıxaracaq. Bunu eşidən Ömər ﵁ dedi: Ey Allahın rəsulu, icazə ver bu münafiqin boynunu vurum. Peyğəmbər ﷺ dedi: “Dəymə, sonra deyəcəklər ki, Muhəmməd öz səhabələrini öldürür.” Sonra Abdullah ibn Ubeyin oğlu Abdullah atasına belə dedi: Vallahi ki, Rəsulullahın güclü, sənin isə zəlil olacağını görəcəksən. Elə də oldu.[2]

- Rəvayət edilir ki, Səhl ibn Səd ﵁ Peyğəmbərin ﷺ Xeybər döyüşündə belə dediyini eşitmişdir: “Mən bu bayrağı elə bir adama verəcəyəm ki, Allah onun əli ilə (müsəlmanlara) qələbə bəxş edəcək.” Əshabələrdən hər biri bayrağın ona veriləcəyinə ümid edərək qalxıb getdi. Səhəri gün (Peyğəmbərin ﷺ yanına) gəldikdə onlardan hər biri bayrağın ona veriləcəyinə ümid edirdi. Amma Peyğəmbər ﷺ: “Əli haradadır?”– deyə soruşdu. Ona dedilər ki, Əlinin gözləri ağrıyır. Onda Peyğəmbər ﷺ onun çağırılmasını

[1] Mişkat əl-məsabih əsəri, Əbu Bəkrin fəzilətləri fəsli 2/556.
[2] Tirmizi, 3315; Şeyx Albani də bu hədisi səhih hesab etmişdir.

əmr etdi. Peyğəmbər ﷺ Əlinin gözlərinə yüngülcə tüpürdü və onun gözləri sağaldı, elə bil heç ağrımırdı. Sonra Əli dedi: "(Xeybərlilər) bizim kimi (müsəlman) olanadək onlarla vuruşacağıq." Peyğəmbər ﷺ buyurdu: "Onların yurduna gedib çatanadək tələsmə. Sonra onları İslama dəvət et və özlərinə vacib buyrulanı onlara bildir. Vallahi, əgər Allah sənin vasitənlə bir nəfəri doğru yola yönəltsə, bu sənin üçün qırmızı dəvələrdən daha xeyirli olar."[1]

- Rəvayət olunur ki, bir dəfə peyğəmbər ﷺ Əliyə ؓ demişdir: "Mənim yerimə uzan, bu yaşıl bürüncəyimi üstünə örtərək yat. Sənə onlar tərəfindən heç bir xətər gəlməyəcək."[2] İbn Həcər demişdir: "Musa ibn Uqbə İbn Şihabdan rəvayət etmişdir ki; Əli ؓ də peyğəmbərin ﷺ yerində yatdı. Qureyşlilər kimin hücum edib peyğəmbəri qətlə yetirməsi barədə mübahisə etdilər. Sonra onlar içəriyə daxil olduqda Əlini gördülər. Ondan peyğəmbəri soruşduqda o, dedi: Mənim xəbərim yoxdur. Onlar bildilər ki, peyğəmbər qaçıb."[3] İbn Abbas ؓ demişdir: "Əli həmin gecə, peyğəmbərin libasını geyinərək onun yerində yatarkən canını fəda etmişdi.[4] Yalnız Allahın razılığını və axirət yurdunu əldə etmək naminə iş görən Əli kimi mücahid səhabələr barəsində Uca Allah buyurur: **"İnsanların eləsi də var ki, Allahın razılığını qazanmaq üçün canını da verər. Allah Öz qullarına qarşı Şəfqətlidir."**[5] [6]

- Bəni Zuhra qəbiləsinin tərəfdaşlarından olan Yaqub ibn Ütbə ibn əl-Muğira ibn əl-Əxnəs ibn Şəriqdən rəvayət olunur ki; Əbu Cəhl Səfa dağında peyğəmbərə ﷺ qarşı çıxaraq ona əziyyət verməyə başladı. O zaman Həmzə ؓ ovla məşğul olurdu. Elə həmin vaxt da ovda idi. Evinə qayıtdıqda xanımı ona olanları danışdı. O, Əbu Cəhlin peyğəmbərə verdiyi əziyyətlərin şahidi olmuşdu. O dedi: Ey Əbu Umarə, kaş ki Əbu Cəhlin sənin qardaşın oğluna nələr

---

[1] Buxari, 4210; Muslim, 6376.
[2] İbn Hişamın Sirası, 2/91: Fəthul bari, 7/236.
[3] Fəthul bari, 7/237.
[4] Fədail əs-sahəbə, 1168, isnadı həsəndir.
[5] əl-Bəqərə, 207-ci ayə.
[6] Möminlərin əmiri Əli ibn Əbu Talibin həyatı, 37-ci səh.

etdiyini görəydin. Bunu eşidən Həmzə qəzəblənir. Sanki heç evinə girməmiş kimi yayı boynundan asılı halda Məscidə daxil olub gördü ki, Əbu Cəhl qureyşlilərlə oturub. Həmzə bir söz demədən yaxınlaşıb yayı ilə onun başını qaldırıb ona bir zərbə endirdi. Qureyşlilərdən biri qalxıb Həmzəni sakitləşdirməyə başladı. Bu zaman Həmzə dedi: " Mənim dinim, Muhəmmədin dinidir, mən şahidlik edirəm ki, o, Allahın rəsuludur. Allaha and olsun ki, bu yolumdan dönəm deyiləm, bacarırsınızsa bunun qarşısını alın. Beləcə Həmzə ﵁ İslamı qəbul etdikdən sonra peyğəmbərin ﷺ və müsəlmanların mövqeyi gücləndi. Kafirlər də qorxmağa başladılar və anladılar ki, o, peyğəmbəri qoruyacaq.[1]

- Cabirdən ﵁ rəvayət olunur ki; "Uhud döyüşü zamanı insanlar qaçmağa baladıqda peyğəmbər ﷺ bir kənarda on iki ənsarla birlikdə idi. Talhə ibn Ubeydullah da onların arasında idi. Müşriklər onlara yaxınlaşdıqda peyğəmbər ﷺ geri çevrilərək dedi: "Bunlara qarşı kim müqavimət göstərər?" Talhə dedi: Mən. Peyğəmbər dedi: "Başqa kim?" Ənsarlardan başqa birisi də dedi: Mən. Peyğəmbər ﷺ dedi: "Sən." Həmin ənsar ölənədək vuruşdu. Peyğəmbər ﷺ eyni sualı tərar etdi və hər dəfə ənsarlardan biri çıxaraq ölənədək vuruşurdu. Sonda Peyğəmbər ﷺ və Talhə ibn Ubeydullah qaldı. Peyğəmbər yenə soruşdu: "Bunlara qarşı kim müqavimət göstərər?" Talhə yenə: Mən – deyə cavab verdi. Talhə də özündən əvvəlki on bir nəfər kimi çıxaraq döyüşdü. Onun qolları yaralandıqda və barmaqları kəsildikdə "Həs" dedi. Rəsulullah dedi: "Əgər "Bismilləh" desəydin, mələklər səni uçurar, insanlar da sənə baxardılar. Sonra Allahın izni ilə müşriklər geri çəkildilər."[2]

- Urvadan ﵁ rəvayət olunur ki; Zübeyr ﵁ İslamı qəbul etdikdə onun səkkiz yaşı var idi. Bir dəfə xəbər yayılır ki, peyğəmbərə Məkkənin yüksək bir yerində əziyyət verilib. Bunu eşidən on iki

---

[1] Heysəminin əl-Məcma əsəri, 9/223; Təbərani bu hədisi mursəl olaraq rəvayət etmişdir, hədisin raviləri etibarlı şəxslərdir.

[2] Nəsai, 3149; Beyhəqinin Dəlail ən-nubuvva əsəri, 3/236-237, Əbu Nueymin "əl-Marifə" əsəri

yaşlı Zubeyr əlinə qılınc alaraq çölə çıxır. Onu görən hər kəs təəccüblənərək: Əlində qılınc tutmuş uşağa baxın – deyir. O peyğəmbərin yanına gəldikdə peyğəmbər ﷺ ondan soruşur: “Nə olub ey Zubeyr?” O da cavabında deyir ki; Gəlmişəm sənə əziyyət verəni qılıncımla vurum. Başqa bir rəvayətdə peyğəm-bər ﷺ soruşur: “Sənə nə olub ey Zübeyr?” O da deyir ki; eşitmişəm sənə əziyyət veriblər. Peyğəmbər ﷺ də bunu eşitdikdə ona və onun qılıncına dua edir.[1]

- Rəvayət edilir ki, Səhl ؓ demişdir: “(Bir dəfə) bir qadın Peyğəmbərə ﷺ haşiyələnmiş parçadan (tikilmiş) bir bürdə gətirdi.” (Səhl hədisə qulaq asan tabiinlərdən soruşdu:) “Heç bilirsiniz bürdə nədir?” Onlar: “Bürüncəkdir”- deyə cavab verdilər. Səhl: “Bəli”- dedi.

(Bürüncəyi gətirən qadın) dedi: “Mən onu öz əllərimlə toxumuşam və gətirmişəm ki, onu sənə geyindirim.” Peyğəmbər ﷺ ehtiyac üzündən bürüncəyi götürdü, sonra da onu geyib bizim yanımıza gəldi. Filankəs onu tərifləyib dedi: “Nə gözəl bürüncəkdir, onu mənə bağışla!” Camaat dedi: “Yaxşı iş görmədin. Axı Peyğəmbər ◎ onu ehtiyac üzündən geyinmişdi. Sən bilə-bilə ki, o (heç kəsi) rədd etmir, bunu ondan istədin.” O dedi: “Vallahi ki, mən bunu ondan geyinmək üçün istəmədim. Mən bu bürüncəyi ondan ona görə istədim ki, o, mənim kəfənim olsun.”

Səhl dedi: “(Axırda) o bürüncək onun kəfəni oldu.”[2]

- əl-Muhib ət-Təbəri demişdir: Hədisdəki filankəs Abdur Rahman ibn Aufdur.[3] İbn Həcər əl-Əsqalani demişdir: “əl-Muhib ət-Təbəri özünün əl-Əhkam əsərində həmin şəxsin Abdur Rahman ibn Auf olduğunu bildirmişdir. O bu sözündə Təbəraniyə isnad etdiyini bildirmişdir . Lakin mən Təbəraninin Mocəmul kəbir əsərində Səhllə Abdurrahmənin müsnədlərində bu barədə heç bir şey tapmadım. Şeyximiz ibn əl-Mülqin də “Umdə” əsərinin şərhində əl-Muhibdən bunu nəql etmişdir. Şeyximiz Hafiz Əbul Həsən əl-Heytəmi də bu rəvayətin əl-Muhibdən gəldiyini bildirmişdir...”[4]

[1] Fədail əs-Sahəbə, 1266.
[2] Buxari, 1277.
[3] Umdətul Qari, 12/256.
[4] Fəthul bari, 4/318.

- Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ (səfərdə ikən) səhərə qədər yatmadı. Sonra Mədinəyə gəlib çatdıqda dedi: "Nə olaydı, əshabələrimdən əməlisaleh bir adam bu gecə məni mühafizə edəydi." Bunu deyən kimi biz silah səsi eşitdik. Peyğəmbər ﷺ: "Kimdir bu?"– deyə soruşdu. (Gələn adam) dedi: "Mənəm – Səd ibn Əbu Vəqqas! Gəlmişəm səni mühafizə edim." (Bundan sonra) Peyğəmbər ﷺ yatdı."
Əbu Osman ﵁ demişdir: "Peyğəmbərin ﷺ döyüşdüyü həmin günlərdə onunla bərabər Talhə ilə Səddən savayı heç kəs qalmamışdı."[1]
- Ənəsdən ﵁ rəvayət olunur ki, Uhud günü Əbu Talhə peyğəmbərin ﷺ yanında ox atır, peyğəmbər ﷺ də onun arxasında qorunurdu. O mahir oxçu idi və hər dəfə ox atanda peyğəmbər ﷺ başını qaldırıb onun oxunun hara dəydiyinə baxırdı. Əbu Talhə isə sinəsi ilə onu qarşısını kəsərək deyirdi: atam-anam sənə qurbaney Allahın rəsulu, qoy sənə ox dəyməsin, bədənim sənin bədənini qorusun. Bu minvalla o peyğəmbərin ﷺ yanında duraraq deyirdi: Mən dözümlüyəm, ey Allahın rəsulu, mənə istədiyin qədər göstərişlər ver."[2]
- Müaz ibn Cəbəldən ﵁ rəvayət olunur ki, bir gün peyğəmbər ﷺ onun əlindən tutaraq dedi: "Ey Müaz, Allaha nad olsun ki, mən səni sevirəm." Müaz dedi: Atam-anam sənə qurban ey Allahın rəsulu, vallahi ki, mən də səni sevirəm. Peyğəmbər ﷺ dedi: "Ey Müaz, tövsiyəm budur ki, hər namazdan sonra bu sözləri deməyi əsla tərk etməyəsən: Allahım Səni zikr etməkdə, Sənə şükür etməkdə və Sənə gözəl bir tərzdə ibadət etməkdə mənə yardım et." Müaz da öz növbəsində həmin tövsiyəni əs-Sanəbihiyə etmiş, əs-Sanəbihi Əbu Abdur-Rahmana, Əbu Abdur-Rahman isə Uqbə ibn Muslimə etmişdi.[3]
- Peyğəmbərin ﷺ sevimlisi olan Zeyd ibn Harisə ﵁ də İslamı ilk qəbul edənlərdən idi. O, Xədiscənin köləsi idi. Xədicə isə onu

[1] Buxari, 3722-3723.
[2] Əhməd, 3/286. Şeyx əl-Arnaut demişdir: İsnadı səhihdir.
[3] Səhih tərğib və tərhib əsəri, 1596.

peyğəmbərə hədiyyə etmişdi. Peyğəmbər ﷺ Xədicə ilə ailə həyatı qurduqdan sonra bir dəfə Zeydin atası ilə əmisi onu almaq üçün gəlmişdilər. Onlar peyğəmbərin ﷺ harada olduğunu soruşduqda onlara peyğəmbərin ﷺ məsciddə olduğunu xəbər verdilər. Onlar peyğəmbərin ﷺ yanına gələrək dedilər: ey Abdullahın oğlu, ey ibn Əbdül-Muttalibin oğlu, ey Haşimin oğlu, ey qövmünün ağasının oğlu, sizlər toxunulmaz məkanın əhalisisiniz və Allahın evinin yanında olanlarsınız. Siz insanlara yardım edir, əsirləri yedirdirsiniz. Biz öz oğlumuzu sizin yanınıza gətirmişik. Xahişimiz budur ki, onu bizə fəda edəsən. Biz də sənin bu fədakarlığını yüksək tutarıq. Peyğəmbər ﷺ soruşdu: "Kimdir o?" Dedilər: Zeyd ibn Harisə. Rəsulullah ﷺ dedi: "Başqa bir təklifə razı olarsınızmı?" Soruşdular; Nə təklifdir o? Dedi: "Qoyun özü seçim etsin, əgər sizi seçmiş olsa o sizin olsun. Yox əgər məni seçsə, vallahi ki, məni seçən birisinin bu ixtiyarına əsla qarşı çıxmaram. Onlar dedilər: Sənin bu təklifin çox təqdirəlayiqdir. Onlar Zeydi çağırdılar və peyğəmbər ﷺ ondan soruşdu: "Bunların kim olduğunu bilirsənmi?" Zeyd: Bəli – deyə cavab verdi. Yenə soruşdu: " onlar kimdir?" Zeyd dedi: Bu mənim atamdır, bu isə əmim. Peyğəmbər ﷺ dedi: "Məni də ki, sən yaxşı tanıyırsan, indi mənimlə onların arasında seçim et." Zeyd dedi: Səndən savayı heç kimi seçmərəm, sən mənə həm ata, həm də ana kimisən. Onlar dedilər: Vay sənin halına, ey Zeyd, köləliyi azadlıqdan, atandan, əmindən və yaxınlarından üstünmü tutursan? Zeyd dedi: Bəli. Mən bu insandan elə bir münasibət görmüşəm ki, ondan savayı heç kimi əsla seçmərəm.Bunu gördükdə peyğəmbər ﷺ Zeydi çılə çıxararaq dedi: "Ey məclis iştirakçıları, şahid olun ki, Zeyd mənim oğlum və varisimdir." Atası və əmisi bunu eşitdikdə xoşlanaraq getdilər. Həmin vaxtdan etibarən onu Zeyd ibn Muhəmməd – deyə çağırmağa başladılar. İslam dini gəldikdən sonra isə Uca Allah aşağıdakı ayəni nazil etdi: **"(Oğulluğa götürdüyünüz uşaqları) öz atalarının adları ilə çağırın."**[1] [2]

---

[1] əl-Əhzab, 5.
[2] Tabəqat əl-kubra, 3/42; Zədul məad, 3/18.

- Əbu Əyyub əl-Ənsaridən ﵁ rəvayət olunur ki, peyğəmbər ﷺ onun evində qalası olur. Peyğəmbər ﷺ aşağı mərtəbədə, Əbu Əyyub isə yuxarı mərtəbədə qalır. Gecənin bir aləmində Əbu Əyub fikirləşir ki, biz peyğəmbərin üstündə necə gəzə bilərik? Onlar çəkilib bir kənarda gecələyirlər. Sonra o bunu peyğəmbərə dedikdə o deyir: "Aşağı mərtəbə daha rahatdır." Əbu Əyyub isə cavabında deyir: altında sən var ikən döşəməyə ayaq basmaram. Beləliklə peyğəmbər yuxarı mərtəbəyə çıxası olur. Əbu Əyyub isə a.ağıda onun üçün yemək hazırlayır. Qabı peyğəmbərin yanından gətirdikdə o peyğəmbərin qabın hansı hissəsini tutduğunu soruşar, sonra da barmaqlarını həmin yerə qoyardı..."[1]

- İbn Şüması əl-Məhri ﵁ demişdir: "Amr ibn əl-As ölüm ayağında ikən biz ona baş çəkdik. O, bir xeyli ağladıqdan sonra üzünü divara tərəf çevirdi. Onda oğlu Abdullah dedi: "Atacan! Peyğəmbər ﷺ səni filan şeylə müjdələməyibmi?! Peyğəmbər ﷺ səni filan şeylə müjdələməyibmi?!" Amr üzünü (bizə) tərəf çevirib dedi: "Mənim tədarük gördüyüm ən əfzəl şey Allahdan başqa məbud olmadığına və Muhəmmədin Onun elçisi olduğuna şəhadət gətirməyimdir. Mən artıq üç mərhələdən keçmişəm. Vaxt var idi Allahın elçisinə ﷺ mənim qədər nifrət edən bir kimsə yox idi. Həmçinin onu yaxalayıb öldürməyim qədər məni sevindirəcək bir şey də yox idi. Əgər bu halda ölsəydim, Cəhənnəm əhlindən olardım.

Allah İslamı qəlbimə yerləşdirdiyi zaman mən Peyğəmbərin ﷺ yanına gəlib dedim: "Uzat sağ əlini, sənə beyət edim!" O, sağ əlini (mənə tərəf) uzatdı, lakin mən əlimi geri çəkdim. Peyğəmbər ﷺ: "Sənə nə olub, ey Amr?"– deyə soruşdu. Dedim: "Şərt kəsmək istəyirəm". Soruşdu: "Nə şərtdir elə?" Dedim: "Bağışlanmağımı (istəyirəm)". O buyurdu: "Məgər bilmirsən ki, İslam özündən

[1] Muslim, 5479.

əvvəlki günahları yox edir?![1] (Bilmirsən) ki, hicrət özündən əvvəlki günahları yox edir?! Bilmirsən ki, həcc ziyarəti özündən əvvəlki günahları yox edir?!" Bundan sonra mənim üçün Peyğəmbərdən ﷺ daha əziz və gözümdə ondan daha hörmətli bir kimsə qalmamışdı. Peyğəmbərə ﷺ bəslədiyim hörmətdən yana, ona baxmaqla gözlərimi doyura bilmirdim. Əgər məndən onu vəsf etmək tələb olunsaydı, mən onu vəsf edə bilməzdim. Çünki mən ona baxmaqla gözlərimi doyura bilmirdim. Əgər bu halda ölsəydim, Cənnət əhlindən olacağıma (qətiyyətlə) ümid edərdim.

Bundan sonra biz elə işlər gördük ki, mən bunlara görə aqibətimin necə olacağını bilmirəm.

Mən öldükdən sonra (heç kəs) vay-şivən salıb ağlamasın, habelə cənazəmi odla müşayiət etməsin. Məni dəfn etdikdən sonra üzərimə torpaq səpin. Daha sonra qəbrimin yan-yörəsində bir dəvənin kəsilib, ətinin paylanılacağı vaxt qədər dayanın ki, sizin sayənizdə öz yerimə isinişim və Rəbbimin elçilərini necə qarşılayacağıma bir çarə qılım".[2]

- Əbu Qatədədən ﷺ rəvayət olunur ki; bir dəfə peyğəmbər ﷺ bizə xütbə verərək dedi: "Siz bu axşamı və bu gecəni keçirərək sabah inşallah su olan yerə çatacaqsınız." İnsanlar da bir - birinə baxmadan dağılışdılar. Əbu Qatədə dedi: Peyğəmbər ﷺ gecə düşənədək getdi, mən də onun yanında idim. Peyğəmbər yorularaq miniyinin üstündə əyildi. Mən də gəlib onu oyatmadan düzəltdim ki, miniyinin üzərində düz otursun. Gecənin bir aləmində getdikdən sonra peyğəmbər ﷺ yenə miniyinin üzərində əyildi. Mən də yenə gəlib onu oyatmadan düzəltdim ki, miniyinin üzərində düz otursun. Səhərə yaxın o yenə əyildi, lakin bu dəfə öncəki iki dəfədən daha çox əyildi və az qaldı ki yıxıla. MƏn yenə gəlib onu düzəltdim və o başını qaldıraraq soruşdu? "Bu kimdir?"

---

[1] Uca Allah buyurur: **"Kafir olanlara de ki, əgər *küfrə* son qoysalar, olub-keçənlər onlara bağışlanar. Yox, əgər *küfrə* qayıtsalar, əvvəlkilərin başına gələn aqibəti gözləsinlər"** ("əl-Ənfal" surəsi, 38).

[2] Muslim, 336.

Dedim: Əbu Qatədə. O yenə soruşdu: “Nə vaxtdan bəri mənimlə gedirsən?” Dedim: Gecə düşəndən bəri. Peyğəmbər ﷺ dedi: “Peyğəmbəri qoruduğun kimi Allah də səni qorusun.”[1]

- Zuhri Umara ibn Xüzeymədən ﵁ rəvayət etmişdir ki, onun səhabə olan əmisi ona nəql etmişdir ki, bir dəfə peyğəmbər ﷺ bir bədəvidən at alır. Onlar atın pulunu almaq üçün yola düşdülər. Peyğəmbər ﷺ sürətlə gedir, bədəvi isə onda geri qalırdı. Bir neçə nəfər bədəviyə çataraq onunla atı almaq barəsində danışmağa başladılar. Onlar həmin atın peyğəmbərə satıldığından bixəbər idilər. İş o yerə çatdı ki, onlar həmin atın müqabilində bədəviyə peyğəmbərin alıdığından daha çox pul təklif etdilər. Bu zaman bədəvi arxadan peyğəmbəri ﷺ səsləyərək dedi: Atı alırsan al, almırsansa mən onu başqasına satıram. Peyğəmbər bədəvinin səsini eşitdikdə dedi: “Məgər mən onu artıq səndən almamışam?” Bədəvi dedi: Vallahi ki yox, mən onu sənə satmamışam. Peyğəmbər ﷺ dedi: “Mən onu səndən alımışam axı.” Beləcə insanlar peyğəmbərlə bədəvinin bir-birinə etikləri etiraza qulaq asdılar. Birdən bədəvi dedi: şahid gətir ki, mən bunu sənə satmışam. Bu zaman insanlar bədəviyə dedilər ki; Vay sənin halına, bu peyğəmbərdir, yalnız haqqı söyləyir. Həmin vaxt Xuzeymə gəlib peyğəmbərlə bədəvinin mübahisəsinə qulaq asırdı. Bədəvi: şahid gətir ki, mən bunu sənə satmışam – dedikdə Xuzeymə ibn Sabit dedi: Mə şahidlik edirəm ki, sən atı ondan almısan. Peyğəmbər ﷺ üzünü ona tərəf çevirərək dedi: “Nə ilə şahidlik edirsən?” Dedi: Səni təsdiq etməklə ey Allahın rəsulu. Bundan sonra peyğəmbər Xüzeymənin şahidliyinin iki nəfərin şahidliyinə bərabər olduğunu bildirdi.[2]

- Musənnə ibn Səid ﵁ demişdir: Mə Ənəsin belə dediyini eşitmişəm: “Elə gecə yoxdur ki, mən öz sevimlimi (peyğəmbəri) görməyim.” O bunu deyərək ağlayırdı.

---

[1] Muslim, 1594.

[2] Əhməd, 5/215; Əbu Davud 3607, Şüeyb əl-Arnaut demişdir: Hədisin isnadı səhihdir və raviləri Umaradan savayı Buxari və Muslimin raviləridir. Yalnız Umara sünən əsərlərinin ravilərindəndir və etibarlı şəxsdir.

Subhanallah, necə də qəribədir. Bizlər heç olmasa bircə dəfə peyəmbəri yuxumuxda görmək istəyirik. Ənəs isə onu hər gün görürdü.

- Musəvvər ibn Məxramə və Mərvandan rəvayət olunan hədisdə deyilir: "... Urva öz camaatının yanına gəlib dedi: Ay camaat, mən bir çox padşahların, o cümlədən Qeysərin, Xosrovun və Nəcaşinin yanına getmişəm. Ancaq Allaha and olsun ki, səhabələrinin Muhəmmədə göstərdiyi hörməti heç yerdə görməmişəm. Vallahi ki, o tüpürdükdə səhabələri onu əli ilə tutaraq üzünə və dərisinə sürtərdi. Onlara göstəriş verdikdə dərhal onu yerinə yetirməyə tələsərdilər. O, dəstəmaz aldıqda onlar peyğəmbərin istifadə etdiyi su üçün az qala bir-biri ilə dava edərdilər. O, danışdıqda onlar əsla səslərini qaldırmaz, ona hörmət əlaməti olaraq gözlərinin içinə dik baxmazdılar. Şübhəsiz ki, o sizlərə doğru yol göstərib..."[1]

- Abdullah ibn Muğaffəldən ﵁ rəvayət olunur ki, Bir nəfər peyğəmbərin ﷺ yanına gəlib dedi: Ey Allahın rəsulu, vallahi ki, mən səni sevirəm. Peyğəmbər ﷺ dedi: "Şübhəsiz ki, bəlalar məni sevənlərə sel kimi sürətli gələr."[2]

Ənəsdən ﵁ gələn rəvayətdə isə deyilir: Bir nəfər peyğəmbərin ﷺ yanına gəlib dedi: mən səni sevirəm. Rəsulullah ﷺ da cavabında ona belə dedi: "Yoxsulluğa hazır ol."[3]

- Abdur-Rahman ibn Əbi Qurad ﵁ rəvayət edir ki, bir dəfə peyğəmbər ﷺ dəstəmaz aldı və səhabələr onun dəstəmaz suyunu bədənlərinə sürtməyə başladılar. Peyğəmbər ondan soruşdu: "Sizi bunu etməyə vadar edən nədir?" Dedilər: Allah və rəsulunun sevgisi. Peyğəmbər ﷺ dedi: "Allah və rəsulunu sevmək və ya Allah və rəsulunun onu sevməsini istəyən kəs, danışanda doğru danışsın, əmanət verildikdə ona xəyanət etməsin və qonşuları ilə yaxşı davransın."[4]

---

[1] Buxari, 2731-2732.
[2] Məvarid əz-Zamən, 2505; Şeyx Albani bu hədisi Səhih hədislər silsiləsi əsərində həsən adlandırmışdır, 1586.
[3] Bəzzarın "əl-Müsnəd" əsəri, 4/229-3595; Şeyx Albani bu hədisi Səhih hədislər silsiləsi əsərində səhih adlandırmışdır, 2827.
[4] Mişkat əl-məsabih, 4990.

- Umeyr ibn İshaq rəvayət edir ki, bir dəfə mən Əlinin ؓ oğlu Həsənlə yol gedərkən Əbu Hureyraya ؓ rast gəldik. Əbu Hureyra Həsənə yaxınlaşıb dedi: “Köynəyini aç Peyğəmbərin ﷺ öpdüyü yerdən öpüm”. Həsən köynəyini açdıqda Əbu Hureyra onun göbəyindən öpdü.

## Son

Əziz qardaşlar, bu kitabda Peyğəmbəri ﷺ sevməyin mahiyyətini açıqlamağa çalışdıq. Allahdan diləyimiz budur ki, kitab bizim Peyğəmbərə qarşı bəslədiyimiz məhəbbəti daha da artırsın, bunun da sayəsində bizi dünyanın müsibətlərindən qorusun, həm dünya, həm də axirətdə bunun faydalarını bizə nəsib etsin.